# "AŞIQ ƏLƏSGƏR" KİTABI TƏQDİM OLUNDU

***2012-ci il sentyabrın 26-da M.F.Axundov adına Azərbaycan Milli Kitabxanasında Mədəniyyət və Turizm Nazirliyinin və Azərbaycan Aşıqlar Birliyinin birgə təşkilatçılığı ilə "Aşıq Ələsgər" kitabının təqdimat mərasimi keçirildi.***




Tədbirin aparıcısı, M.F.Axundov adına Milli Kitabxananın direktoru **Kərim Tahirov** AAB-nin "Elm və təhsil" nəşriyyatında "Ustad aşıqlarımız" seriyasından nəfis tərtibatla çap etdirdiyi "Aşıq Ələsgər" kitabı haqqında məlumat verib. O, eyni zamanda Aşıq Ələsgərin həyatından, yaradıcılığından danışaraq dedi ki, Aşıq Ələsgər özündən sonra gələn aşıqlara qüvvətli təsir göstərib və Azərbaycan ədəbiyyatında böyük iz buraxıb.

AAB-nin sədri, Xalq şairi, kitabın məsləhətçisi **Zəlimxan Yaqub** "Ustad aşıqlarımız" seriyasından ilk kitabın Aşıq Ələsgərə həsr edilməsinin heç də təsadüf olmadığını vurğulayaraq, onu zəmanəsinin və bütün dövrlərin ən böyük aşığı və şairi kimi dəyərləndirdi: *"Yazılı ədəbiyyatımızda Füzuli kimdirsə, şifahi ədəbiyyatımızda da Ələsgər o deməkdir. Aşıq Ələsgər aşıq şeirinin zirvəsidir, həmişə də belə olaraq qalacaq.*

*Aşıq Ələsgər haqqında çox kitablar çıxıb bu günə qədər, hələ yenə də çıxacaq. Aşıqlar Birliyi olaraq biz də fikirləşdik ki, "Ustad aşıqlarımız" seriyasından ilk kitabı Aşıq Ələsgərə həsr edək. Aşıq Ələsgərlə*




*bağlı burda mənim poemam da gedib. Mən xoşbəxt insanam ki, Göyçədə Aşıq Ələsgərin qəbrinə əl sürtmüşəm, onun nəvələri, nəticələri ilə söhbət eləmişəm. Aşıq Ələsgərlə bağlı kim nə iş görüb, görəcək hamısına minnətdarlığımı bildirirəm. Aşıq Ələsgərlə bağlı qoy hamı işləsin, hamı fəaliyyət göstərsin. Bu kitabın tərtib edilməsində* ***Musa Nəbioğlunun*** *çox böyük zəhməti var. Bu kitab onun zəhmətinin bəhrəsidir".*

Mədəniyyət və Turizm Nazirliyinin şöbə müdiri **Fikrət Babayev** Aşıq Ələsgərin xalqımızın mədəniyyət xəzinəsinə qızıl incilər bəxş etdiyini, hər zaman aşığın ehtiramla yad edildiyini bildirdi.



Azərbaycan Milli Elmlər Akademiyasının Nizami adına Ədəbiyyat İnstitutunun direktor müavini **Məhərrəm Qasımlı** ədəbiyyatımızda xüsusi yeri olan Aşıq Ələsgərin əsərləri əsasında hər il dissertasiyaların yazıldığını diqqətə çatdırdı.

Filologiya elmləri doktoru **Qəzənfər Paşayev** Aşıq Ələsgərin əsərlərində yüksək sənətkarlıq xüsusiyyətlərindən danışdı, onun bədii ifadə vasitələri ilə zəngin olan dəyərli irsinin daha ciddi tədqiq edilməsi istiqamətində lazımi işlər görüldüyünü bildirdi.



Prezident təqaüdçüsü, şair **İlyas Tapdıq,** filologiya elmləri doktoru, professor **İsmayıl Məmmədli**, şair **Musa Ələkbərli** və **Hacı Loğman Qorqud,** Əməkdar mədəniyyət işçisi, Prezident təqaüdçüsü **İsfəndiyar Rüstəmov**, şəxsi mənzilində Aşıq Ələsgər muzeyi yaradan **Hüseyn Hacı Qulu oğlu** və başqaları çıxış edərək kitabın əhəmiyyətindən danışdılar.



Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının maliyyə dəstəyi işıq üzü görən kitabın tərtibçisi və nəşrə hazırlayanı **Musa Nəbioğludur**. Kitab Xalq yazıçısı



**Elçinin** məqaləsi ilə başlayır. Kitaba ayrı-ayrı alimlərin görkəmli söz ustadı haqqında yazdıqları məqalələr, Xalq Şairi **Zəlimxan Yaqubun** "Göyçədən gələn səslər" poeması və ustad aşığın yaradıcılığından nümunələr daxil edilib.



Sonda AAB-nin katibi, "Ozan dünyası" jurnalının baş redaktoru **Musa Nəbioğlu** çıxış edərək kitabın hazırlanmasında ona dəstək olanlara minnətdarlığını bildirdi və Birliyin gələcək planlarından danışdı.



Böyük söz ustadının nəticəsi **Nizami Ələsgər** isə kitabı araya-ərsəyə gətirənlərə, tədbirin təşkilatçılarına və iştirakçılarına minnətdarlığını bildirdi.

**Könül Ülviyyə**

# AŞIQ SƏNƏTİ TARİXİ MİSSİYA DAŞIYAN BİR SƏNƏTDİR

**Müsahibimiz AMEA-nın müxbir üzvü, Millət vəkili Nizami Cəfərovdur**.

***Nizami Cəfərov:*** *"Geyimindən, görkəmindən başlamış danışığına, ədasına, sənət imkanlarına qədər aşıq həm tarixini saxlamalı, həm də müasirləşməlidir".*



– **Nizami müəllim, aşıq sənətinin dünəni və bu günü, ümumiyyətlə, mədəniyyətimizdə, incəsənətimizdə rolu barədə Sizin fikirlərinizi bilmək istərdik**.

– Aşıq sənəti başqa sahələrlə müqayisədə sənətkarlıq baxımından xüsusi tarixi missiya daşıyan bir sənətdir. Əvvəla ona görə ki, aşıq sənəti, istər yazılı ədəbiyyat olsun, istər digər bədii-estetik yaradıcılıq sahələri olsun, onlardan daha çox öz tarixiylə bizi Türk dünyasına bağlayır. Yəni qaynaqları, mənbələri çox qədimdir və çox da aydındır. Heç bir mərhələdə biz aşıq sənətinin dayandığını, dövri səciyyə daşıdığını görməmişik. Həmişə mükəmməl bir tarixlə mərhələlərini verə-verə ozanlıqdan başlamış bu günə qədər gəlib çatmışdır. Bu gün xüsusi mistik səciyyə daşımasa da, aşıq yaradıcıdı, şeirini deyir, havalarını ifa edir. Öz görkəmi ilə müəyyən qədər etnoqrafik məzmuna malikdir, (məsələn, bu gün şairlər üçün xüsusi uniforma təsəvvür etmirik, amma aşıqlarda var) yəni müəyyən qədər bu etnoqrafik görüntünü saxlayıb, amma bununla yanaşı, o mistikasını saxlamayıb. Bununla yanaşı, deyim ki, bu sənət çox qədim

əcdad varisliyinə malikdir və mən hesab edirəm ki, bu, çox mühüm, əhəmiyyətli hadisədir.

Bu gün biz aşıq sənətinin tarixindən danışanda, ümumiyyətlə, aşığı təsəvvür edəndə istər-istəməz yadımıza tarix gəlir. Bugünkü şair, yazıçı haqqında danışanda isə o qədər də tarix yadımıza düşmür. Bugünkü şairlərin, yazıçıların yaradıcılığını mən tarixi planda öyrənmişəm. Bizim elə şairlərimiz var ki, onun təfəkküründə nəinki qədim türk dövrü poeziyasının, heç orta əsrlər poeziyasının da yaddaşı yoxdur. Yəni elə bil ki, şeirdə, yazılı ədəbiyyatda, yazılı poeziyada biz o mərhələləri unudaraq arxada qoymuşuq. Amma aşıq unudub arxada qoymayıb. Ona görə də müasir dövrdə bizim üçün xüsusi əhəmiyyətlidir ki, aşıq sənəti ilə biz sözdə yox, yəni elə-belə söz demək xatirinə yox, mahiyyətcə öz tariximizi yaşadırıq. Burada bir sual ortaya çıxa bilər ki, aşıq əgər tarixidirsə, həddindən artıq etnoqrafikdirsə, onda bu gün onun müasir dəyəri az deyilmi? Amma hadisələr göstərdi ki, yox, aşıq sənəti öz mahiyyətini, məzmununu, tarixini, yaddaşını unutmadan da müasirləşə bilir. Amma bu sənətin çox qəribə qoruyucu bir xüsusiyyəti var: yazılı ədəbiyyatdan fərqli olaraq aşıq həddindən artıq müasirləşəndə, dövrün sosial-ideoloji tərəflərinə həddindən artıq cavab vermək istəyəndə dərhal onda korşalma əmələ gəlir. Bunu biz ötən əsrin 20-ci illərindən başlayaraq 30-cu, 50-ci illərdə gördük ki, sosializm quruculuğuna, sovet həyat tərzinə münasibət göstərməyə məcbur olunanda aşıq tipologiyasını necə itirir. Amma yazılı ədəbiyyat, şeir itirmədi. O, daha çox dəyişə bildi, bir mərhələ yaratdı və sonra da bundan imtina olunmadı. Amma aşıq sənəti sonrakı dövrlərdə bundan imtina elədi. Məsələn, Mikayıl Azaflı meydana çıxdı və məlum oldu ki, ötən əsrin 20-ci, 30-cu, hətta 50-ci illərində yaranmış müəyyən "etiket" mövzular, ideyalar sən demə aşığın yaddaşından asanlıqla silinə bilərmiş. O şey ki, aşığa aid deyil, onun tarixi missiyasına aid deyil, o, asanlıqla silinib gedə bilir. Halbuki yazılı ədəbiyyatda, şeirdə bu, silinmir, müəyyən dərəcədə tarix kimi qalır.

İndi müasir dövrdə bizim dövlətin mədəniyyət siyasətinin tərkib hissəsi kimi iki sənət sahəsinə xüsusi yer ayrılır. Onlardan biri muğam sənətidir, biri də aşıq sənəti. Əlbəttə, muğam sənəti kifayət qədər milli, bizim dərk elədiyimiz, ruhumuza uyğun olan sənətdir və Azərbaycan muğamının hər halda şərq muğamı tərkibində özünəməxsusluğu var. Müxtəlif tədbirlərdə də biz görürük ki, ərəb muğamı, fars muğamı tamam ayrı şeydi, Azərbaycan muğamı ayrı şey. Azərbaycan muğamı daha çox təmizdir, ərəb, fars muğamında isə bir xeyli dərəcədə sənətdən əlavə başqa şeylər də var. Məsələn, ruhani melodik sistem var, oxunan şeir mətninin məzmununda ilahilik daha çoxdur. Azərbaycan muğamında isə

daha çox sənət güclüdür. Bununla yanaşı, mən düşünürəm ki, hər halda muğamı aşıq sənəti ilə müqayisə eləmək olmaz. Aşıq sənətini bu millətin təbiəti və onun yaradıcılıq mahiyyətində dərk eləmək lazımdır. Əvvəla, muğamın tarixi o qədər qədim deyil. İkincisi, əlbəttə, muğamda bir sıra ümumşərq mədəniyyətindən götürdüyümüz elə xüsusiyyətlər var ki, onlar Türk dünyası üçün ümumi deyil. Aşıq sənəti isə musiqidən başlamış ta sözünə, ideyasına qədər bütün türk dünyasının ən ibtidai, ən geri qalmış mədəniyyətlərində belə bu gün mövcuddur. Bu musiqi, bu şeir texnikası min illərlə qalıb və nisbətən inkişaf eləmədiyi xalqların yaradıcılığında da biz aşığı görürük, yəni o mənada kökləri kifayət qədər dərindir. Bir məsələ də var ki, aşıq mahnısının, sazın həm peşəkarları var, həm də o, bütövlükdə xalqa məxsusdur. Yəni sazı qeyri-professional da çalır, aşıq şeirini qeyri-professional da qoşur, bu isə o deməkdir ki, bu, xalqın təkcə sənətkarlığı, sənəti deyil, onun yaşam tərzidir, həyat tərzidir, mənəviyyatıdır. Amma muğamda peşəkarlıq, professionallıq daha çoxdur. Yəni hər adam muğam ifa edə bilməz, amma hər adamın potensialı, gücü var ki, onu ifa etsin. Bir maraqlı cəhət də var və biz onu dəqiq bilirik ki, Azərbaycanın etnik tərkibində, etnik coğrafiyasında kifayət qədər zənginlik var. Burada müxtəlif etnoslar – Qafqaz, İran, Türk etnosları yaşayıb və aşıq sənəti, onun yaradıcılıq özünəməxsusluğu, mənbəsinin möhkəmliyi türklərə məxsusdur. Burada mübahisəli bir şey yoxdur. İkinci çox mühüm cəhət də var ki, başqa xalqlar, qeyri-türk mənşəli azərbaycanlılar, ümumiyyətlə, Qafqaz xalqları muğamdan daha çox aşıq sənətini imitasiya ediblər. Yəni bu, onlara asan gəlib, onlar üçün də doğmalaşıbdır. İndi məlum məsələdir ki, 16-cı əsrdən bu günədək 300-ə qədər erməni aşığı Azərbaycan dilində yazıb-yaradıb, hətta müəyyən məqamlarda dastanların yurd hissəsini erməni dilinə tərcümə ediblər, yazılı tərcümə öz yerində, şifahi danışanda erməni məclisində ermənicə danışıblar, ancaq şeirləri türkcə, Azərbaycanca oxuyublar.

Aşıq sənəti bizim üçün birləşdirici bir missiyadır. Həm bizim yaratdığımızdır, həm də bizi birləşdirən bir hadisədir. Aşıq sənətinin musiqisini, şeir texnologiyasını, dastan yaradıcılığını, epos yaratmaq hissiyyatını təhlil eləsək görərik ki, bu, çox mükəmməl, zəngin və olduqca da mürəkkəb bir hadisədir. Amma olduqca da sadəliyi var. Yəni yaradılması baxımından elə bil xalqın təbiətinə yazılıb ki, sən bu mürəkkəbliyi çox rahat şəkildə yaşat, çox rahat şəkildə yarat. Bu da xalqın fəlsəfəsidir və bu gün üçün çox əhəmiyyətlidir. Bu gün bizim dövlətimiz aşıq sənətinin inkişafı ilə bağlı böyük maraq göstərir və xüsusi qanunların qəbul olunması, onun dünya miqyasında təbliği üçün hüquqi prinsiplərin, sənədlərin işlənib hazırlanmasına çalışır və onu dünyanın böyük mədəni sərvətlərinin bir

hadisəsi kimi təqdim eləyir ki, bu da bizim dövlətimizin milli mövqe ifadə eləməsidir və aşıq sənətinə qayğı, aşıq sənətinin dünya miqyasında təbliğ olunması Azərbaycan dövlətinə hörmət gətirən bir məsələdir. Yəni onun milliliyini göstərən bir məsələdir və onu da deyim ki, bu, bizim dövlətimizin mədəniyyət siyasətinin tərkib hissəsidir. Və ən maraqlı cəhətlərdən biri də budur ki, bu gün aşıqdan, aşıq sənətindən ötən əsrin 20-30-cu illərində olduğu kimi məqsədli istifadə olunmur. Doğrudur, o illərdə aşıqların qurultayları keçirilirdi, amma eyni zamanda qurultaylar keçirilə-keçirilə aşıq sənəti məhv olurdu. Bu gün isə artıq hər şey verilib aşıqların öz öhdəsinə. Yəni aşıq yaradıcılığı bugünkü dövrdə necə fəaliyyət göstərə və inkişaf edə bilər, tarixi ənənələrini qorumaqla necə müasir ola bilər – bütün bunlar onun doğal inkişafının öhdəsinə buraxılıb. Artıq aşığa deyilmir ki, bu mövzuda yaz, bu istiqamətdə fəaliyyət göstər, bu işləri gör, hətta heç o da deyilmir ki, mütləq get xalq qarşısında, rəsmi məclislərdə çıxış elə. Bunlar deyilmir. Və mən düşünürəm ki, XX əsrin 20-30-cu illərində aşıqlar kolxozdan, fermadan, təsərrüfatdan yazmağa, oxumağa məcbur edilsələr də, o dövrdə keçirilən qurultaylar bütövlükdə Azərbaycan musiqisinə, böyük sənətkarların yaradıcılığına müəyyən qədər təsir də elədi. Məsələn, Üzeyir Hacıbəyli aşıqların qurultaylarında bir təşkilatçı kimi fəaliyyət göstərərək bu sənətlə daha yaxından tanış oldu və nəticə etibarilə “Koroğlu” operasını yaratdı. Onun xatirələrində də var ki, mən aşıq sənəti ilə o qədər əlaqəli deyildim və onun mahiyyətini də o qədər bilmirdim. Amma bütünlükdə düşüncəsi, yaradıcılıq xüsusiyyətləri muğam, Avropa texnologiyası üzərində qurulan Üzeyir Hacıbəyli aşıq sənətini görəndən sonra ən möhtəşəm əsərini yazdı və bu gün biz görürük ki, “Koroğlu” uvertürasında aşıq musiqisinin nə qədər təsiri var. Və onda nə qədər müasir olmaq imkanı, nə qədər vətənpərvərlik var.

Aşıq sənətinin potensialı həddindən artıq güclüdür və elə bilirəm ki, aşıq sənətindən bu cür, yəni onu siyasiləşdirmədən, idealojiləşdirmədən istifadə etmək lazımdır. Yəni demək istəyirəm ki, əgər ötən yüzilliyin 20-30-cu illərində bizim ictimai şüurumuz aşıqlara lazımi köməyi göstərərək sənət meydanına çıxardıb, amma nə demək, nə etmək lazım olduğunu onların öz öhdəsinə buraxsaydı, onlar sosializmin yaxşı cəhətlərini, insanların biliklənməsini, savadlanmasını – sosializmin üstün cəhətləri də var axı, – dəqiq təhlillər edib daha gözəl sənət əsərləri yarada bilərdilər. Biz bunun təcrübəsini Şah İsmayıl Xətai dövründə görmüşük. Mən inanmıram ki, Şah İsmayıl Xətai xüsusi proqram verirdi ki, aşıqlar onunla hərəkət etsinlər, sadəcə olaraq onlara meydan açırdı. Əslində Şah İsmayıl Xətai aşıqlara təsir eləmirdi, aşıqlar Şah İsmayıl Xətaiyə təsir

edirdi ki, o da öz gözəl şeirlərini aşıq üslubunda yazırdı. Yəni bir daha qeyd etmək istəyirəm ki, çox güclü potensialı var aşıq sənətinin. Bizim görə bildiyimiz, görə bilmədiyimiz çoxlu potensial var. Sadəcə olaraq aşıqlara kömək etməklə, onların təşkilatı işlərini görməklə yanaşı, nəyi necə yaratmağı onların öz öhdəsinə buraxmaq lazımdır. Çünki biz hamımız əminik ki, tarixdən gələn potensial bu gün kifayət qədər güclüdür.

Uzun müddət aşıqlar sıxışdırılıb, xeyli dərəcədə kənarda qoyulubdur. Deyək ki, ümumi yaradıcılıq, sənət yaradıcılığı missiyasına görə uzun müddət aşıqlara elmi-professional baxımdan və eləcə də dövlət idarəçiliyi, mədəniyyət siyasəti baxımından folklor hadisəsi kimi yanaşılırdı. Bununla da razılaşmaq mümkün deyil, aşıq sənəti yaradıcılığının yarıya qədəri folklordur. Biz folklor, şifahi xalq ədəbiyyatı deyəndə ona bir az aşağılayıcı təyinat vermişik və təsadüfi deyildir ki, keçən əsrin 30-cu, 50-ci illərində Azərbaycanın ən böyük şairi olan Səməd Vurğunu bəyənməyənlər, tənqid etmək istəyənlər ona aşıqdı deyirdilər. Yəni görürsüz ki, nəticə etibarilə aşıq sənəti sıxışdırılanda gəlir harada təzahür edir? Səməd Vurğunda! O mənada bizim həm də yazılı poeziyamızın ən mühüm qaynağıdır bu sənət. Ən mühüm. Yəni ondan mühüm qaynağı yoxdur. Biz onu Şah İsmayıl Xətai yaradıcılığında da görmüşük, yeni Azərbaycan ədəbiyyatının banisi Molla Pənah Vaqifin, Molla Vəli Vidadinin, Qasım bəy Zakirin yaradıcılığında da görmüşük. Yəni ən proqressiv, ən mükəmməl və ən milli poeziyanın əsasında aşıq poeziyası dayanır.

– **Bu gün biz istəsək də, istəməsək də ənənəvi ustad-şəyird münasibətləri aradan çıxmaq üzrədir. Buna münasibətiniz?**

– Mən belə fikirləşirəm ki, buna da təbii baxmaq lazımdır. Əvvəllər dəmirçi dəmirçinin, dülgər dülgərin yanında yetişirdi, yəni bu sahədə ayrıca məktəblər yox idi. Eləcə də Türk dünyasının hər yerində manas manasçının, aşıq da ustad aşığın yanında yetişirdi. Çünki kitab və başqa cür imkanlar yox idi. İndiki dövrdə isə təhsil var, məktəb var. Texnologiya sürətlə inkişaf edir, informasiya sahələri genişlənib və bu gün nəyisə öyrənmək üçün çox uzun illər tələb olunmur. Bu gün cəmiyyət daha aktivdir, qloballaşma dövrüdür. İnsanlar vaxtilə on ilə öyrəndiklərini indi iki-üç ildə öyrənə bilirlər. Və bu gün muğamı necə öyrənirlərsə, aşıq sənəti də elə öyrənilməlidir. Amma mürəkkəblik nədədir? Aşıq sənəti təkcə musiqi, saz çalmaq, yalnız oxumaq deyil. Aşıq sənəti eyni zamanda yaradıcılıqdır. Burada şairlik, mütəfəkkirlik, dünyanı dərk eləmək var. Biz bu gün də bəzi aşıqlarda, Sarı Aşıq, Qurbani, Aşıq Ələsgər səviyyəsində olmasa da, hər halda o mükəmməllik iddiasını görürük.

Yəni aşıq məclisə gələndə, söz deyəndə özündən gələn təbiətlə onun özü də hiss edir ki, bu məclisdə ən müdrik adam odur və biz də o aşıqdan nə qədər məlumatlı, nə qədər ədəbiyyatı, sənəti, musiqini bilən olsaq da, bizdə də həmişə elə təsəvvür yaranır ki, aşıq bizdən yuxarıdadır, bizdən müdrikdir. Bunun özü bir göstəricidir və hələlik aşıq onu itirməyib. Nə qədər aşığa yuxarıdan aşağı münasibət ünsürləri, elementləri, təzahürləri olsa da, amma o biri tərəf daha güclüdür. Mən düşünürəm ki, məktəb lazımdır, özü də burada tək musiqi yox, başqa sahələr də öyrədilməlidir. Əlbəttə, bizim dövlətimiz buna da çalışacaq və artıq müəyyən mülahizələr, söhbətlər var. Aşıqlar Birliyinin yaradılması artıq xüsusi hadisədir və bunun metodikası da Aşıqlar Birliyindən gəlməlidir. Bu gün bizim nə qədər istedadlı saz çalan, hətta dastan danışmaq, yaxud yarı dastan fəlsəfi söhbət eləmək imkanları olan gənclərimiz var. Bu, xalqın yaradıcılığında var və təbiətən gedir. İstəyirsən lap bu gün aşıqlığı qadağan elə, bu, yenə də olacaq. Amma bütün bunları tətbiq etmək, daha yaxşı öyrətmək üçün metodika hazırlanmalıdır. Yəni peşəkar təhsil olmayan yerdə sadəcə təbii gedişlə sənəti yüksək səviyyəyə qaldırmaq və bugünkü dünyanın mədəniyyət, incəsənət, sənət aktları sistemində üstünlük qazanmasına nail olmaq çox çətindir. Mütləq o, məktəb, universitet səviyyəsində öyrənilməlidir.

Və burada ustad-şəyird ənənəsinin müəyyən elementlərini mütləq onların öz ixtiyarına buraxmaq lazımdır ki, sənətə yeni gələnlərin ustadlarla əlaqələri olsun.

**– Sizcə, bugünkü aşıq necə olmalıdır?**

– Mən düşünürəm ki, geyimindən, görkəmindən başlamış, danışığına, ədasına, sənət imkanlarına qədər aşıq həm tarixini saxlamalı, həm də müasirləşməlidir. Müasirləşməlidir deyəndə birdən-birə nə isə yeni, müasir bir şey yaradılmasını nəzərdə tutmuruq. Burada söhbət dünənin, keçmişin, yəni mövcud olanların müasirləşdirilməsindən gedir. Baxın, insan yaranandan milyon illərdir özünə yuva tikir. Lap qədimlərdə yerin altında, sonra üstündə, indi isə göydələnlər tiksə də, mahiyyət eynidir. Aşıq sənətində də eynidir və tarixdə yaxşı nə varsa hamısını saxlamaqla bugünkü tələblərə cavab vermək lazımdır. Bu tələblərdən biri də – biz onu hər sahədə: musiqidə də, rəssamlıqda da, şairlikdə də görürük – estradaçılığı mənimsəməkdir. Məsələn, bu gün şairlər öz şeirlərini səhnədən oxuyanda adama daha xoş gəlir. Aşıqlığın içərisində bu estradaçılıq güclü olub, amma o dövrün səviyyəsində olub. Primitivləşmək, yüngül bir hadisəyə çevrilmək səviyyəsində yox, sözün

geniş mənasında o zəngin, müdrik peşəkarlığı saxlamaqla estrada təmayülü, xalqla birbaşa təmas təmayülü, xalqın sevimlisi olmaq təmayülü qazanmalıdır aşıq. Həqiqətən, məsələn, Aşıq Ədalət başdan-ayağa estradadır. Aşıq neyləyə bilərsə, gücü nədirsə, o səviyyədə məclisdə özünü təqdim eləyir. Hamıya da xoş gəlir. Görünür, bu, onunla bağlıdır ki, bütün sənətlərdə olduğu kimi, aşıqlıq sənətində də aşıq gəlir gətirməyi, pul qazanmağı, öz mətahını bazara çıxarmağı bacarmalıdır. Bununla bağlı biz yeni qanun qəbul edirik və burda prodüser anlayışına geniş ehtiyac olacaq. Çünki aşıq özü gəlib birdən-birə nəyisə ifa edə bilməz, özünü göstərə bilməz. Zaman, şərait, harada, necə və s. bütün bunları prodüser müəyyənləşdirir. Bu dünyada yalnız mənəvi qazancla yaşamaq mümkün deyil, mütləq maddi təminat olmalıdır.

– **Bu gün aşıqlarımıza dövlət qayğısı var. Onlara fəxri adlar verilir, prezident təqaüdü alan aşıqlarımız da var. Ancaq bilirsiniz ki, bu sənətlə məşğul olanların əksəriyyəti başqa heç bir yerdə işləmirlər. Sizcə, onların sosial müdafiəsi üçün nə kimi tədbirlər görülməlidir?**

– Ümummilli liderimiz Heydər Əliyevin hələ sovet dövründə hakimiyyətə gələndən xüsusi mədəniyyət siyasəti olub. Sovet hakimiyyətində yaşamış xalqların təcrübəsində yoxdur ki, sənət adamına bu qədər qayğı göstərilsin. Hətta o dövrdə sənət adamına Sosialist Əməyi Qəhrəmanı adı da verirdilər. Hər halda bunun o dövrlə əlaqədar müəyyən bir diplomatiyası da var idi. Bu, azərbaycanlı bir şairə, söz adamına, ziyalıya ittifaq miqyasında nüfuz qazandırırdı. Heydər Əliyev bunu bilirdi və ziyalıya nüfuz qazandırırdı. Bu, sonra da davam etdirildi. Bunlar bizim dövlətimizin mədəniyyət siyasətinə çevrildi və təbiidir ki, keçid dövründə mürəkkəblik əmələ gəldi. Hər bir dövlət, xüsusilə yeni qurulan dövlət sənət adamına – o, dövlətin mənəviyyatıdır, ideolo-giyasıdır, – xüsusi qayğı göstərməlidir, ancaq bununla yanaşı, imkan məhdudiyyəti də var. Odur ki, həm o tərəf nəzərə alınmalıdır, həm bu tərəf. İndi biz Mədəniyyət haqqında qanunda təbiidir ki, bu ənənəni saxlayırıq, çünki bu, ümummilli liderin böyük dövlət quruculuğu prinsipləridir. Odur ki, dövlət qayğısı bütün sənət adamlarına, o cümlədən aşıqlara həmişə olub, bundan sonra da get-gedə güclənəcək. Dövlətin maddi imkanı artıqca, beynəlxalq əlaqələri gücləndikcə, istər-istəməz onun nəzarəti altında olan hər şeydə güclənmə, möhkəmlənmə prosesi gedəcək, o cümlədən də aşıq sənətində. İkinci bir tərəfdən, təbiidir ki, xüsusilə keçid dövründə Azərbaycan dövləti kimi milli dövlətlər həmişə çalışırlar ki, gələcək üçün, onların müstəqilliyi üçün bir baza yaransın ki, müstəqil fəaliyyət

göstərə bilsinlər. Bunun üçün də müxtəlif yollar var: Dövlət sifarişləri, dövlət konsertləri ola bilər, gənc aşıqlara xüsusi qayğı göstərilə bilər, məktəb-təhsil səviyyəsinə qayğı ola bilər. Burada fərdi təşəbbüslər də ola bilər. Və bunlar olacaq. O ki qaldı, bu birliklərin fəaliyyəti səviyyəsində nələr etmək olar? Əgər Azərbaycan Yazıçılar Birliyi, Bəstəkarlar İttifaqı, Rəssamlar İttifaqı varsa, Aşıqlar Birliyi də bu səviyyədə qurumdursa, bu qurumun funksiyaları gücləndirilməlidir. Bunun üçün maddi imkanlar yaradılmalı, xüsusilə də idarə aparatı gücləndirilməlidir ki, bu, işləsin, problemlər barədə ardıcıl məlumat verilsin. İndi bu birliklər həm maddi, həm də mənəvi baxımdan daha çox Mədəniyyət və Turizm Nazirliyinə bağlıdır və çalışmaq lazımdır ki, qaldırılan məsələlər nazirliyin gücü, imkanı daxilində həll olunsun. Qaldı, aşıqların təqaüd məsələsinə, bu, mənim üçün də maraqlıdır və əgər hər hansı bir aşıq Aşıqlar Birliyinin üzvüdürsə, yaşlaşdıqdan sonra onlara təqaüd verilməlidir. Bizdə bu ənənə olub. Məsələn, Yazıçılar İttifaqının üzvü heç yerdə işləməyibsə, o, yaşlaşanda təqaüd alırdı, indi bilmirəm orda vəziyyət necədir (doğrudur, onların çox hissəsi işləyir və belə bir problemləri də yoxdur), eləcə də Bəstəkarlar İttifaqı, Rəssamlar İttifaqının. Ancaq aşıqlar işləmir axı. Onların cüzi bir hissəsi işləyir. Bunlar nəzərə alınmalı, onlara təqaüd verilməlidir. Nə qədər dövlət qayğısı imkanı varsa, o, dövlətdən gözlənilməlidir. Amma bununla yanaşı, fərdi yaradıcılığı da həvəsləndirmək lazımdır. 19-cu əsrdə, 20-ci əsrin əvvəllərində Azərbaycanda təbiidir ki, çoxlu sayda aşıqlar olub, amma yaddaşımızda daha çox Aşıq Ələsgər qalıb. Niyə? Çünki burada yaradıcılıq, istedad fərdi hadisədir. Biz nə qədər onları ümumiləşdirsək də, birinci növbədə nəzərə almaq lazımdır ki, sənəti, mədəniyyəti, incəsənəti fərd yaradır. Çoxlu bəstəkarlar ola bilər, amma hər dəfə Üzeyir Hacıbəyli, Qara Qarayev, Fikrət Əmirov olmayacaq. Bu ümumini, əlbəttə, maraqlandırmaq lazımdır, amma bu da Heydər Əliyevin mədəniyyət siyasətində çox mühüm hadisədir: xüsusi istedada xüsusi qayğı lazımdır. Aşıqların hamısına qayğı lazımdır, amma bu da Aşıqlar Birliyinin funksiyasına daxildir ki, kim xüsusi istedaddırsa, ona xüsusi qayğı göstərilməlidir. Hamı Ədalət Nəsibov, Kamandar Əfəndiyev, Dərya Məhəmməd ola bilməz. Bu da ola bilər ki, aşıq olsun, böyük istedadı olsun, amma üzə çıxmasın. Ona görə də yeri gələndə onların nazlarıyla da oynamaq lazımdır. Əlbəttə ki, o informasiyanı, təklifi də həmişə Aşıqlar Birliyi verməlidir. Yeri gəlmişkən, bir hadisəni xatırlatmaq istəyirəm. Respublika günü münasibətiylə "Buta" sarayında keçirilən tədbirdə Xalq şairi Zəlimxan Yaqubla birlikdə cənab prezidenti təbrik edərkən onun ilk sözü bu oldu ki, Zəlimxan müəllim, Gədəbəydə Aşıqlar evinin əsasını qoyduq. Yəni dövlət başçısı səviyyəsində bu sənətə

maraq, diqqət var, davamlı, ardıcıl işlər görülür. Mehriban xanım Əliyevanın YUNESKO-da kifayət qədər böyük mübarizəsi sayəsində aşıq sənəti qeyri-maddi mədəni irs üzrə siyahıya salınaraq dünya mədəniyyəti inciləri sırasında öz yerini tutdu. Bunlar balaca işlər deyil, böyük işlərdir. Xalqın mədəniyyətini taleyin ümidinə buraxmaq olmaz.

Bir şey də var ki, sənətkarlar çox zaman münaqişəyə, qruplaşmalara meyilli olur. Bu, həmişə var. Sənətkar iddialı olur, və o iddiadan gələn məsələlər də var. Ötən əsrin 90-cı illərində Aşıqlar Birliyinə rəhbərlik etmək üçün münaqişələr olurdu. Hüseyn Arif kimi nüfuzlu adam bu quruma rəhbərlik etdiyi zaman nə qədər münaqişənin qarşısını alırdısa, amma yenə görürdün ki, nə isə ortaya çıxır. İndi Birliyə Zəlimxan Yaqub rəhbərlik edir, o, xüsusi nüfuzlu insandır, xüsusi istedaddır. Hər sahədə hamı onunla hesablaşır, aşıqlar da o cümlədən.

– **Nizami müəllim, bəzi özəl televiziya kanallarının aşıq sənətinə "özəl" münasibəti barədə nə deyə bilərdiniz?**

– Bu, qaçılmaz bir vəziyyətdir. Mən fikirləşirəm ki, gərək Aşıqlar Birliyi aşıq sənətinin təbliği ilə bağlı formaları özü müəyyənləşdirsin. Aşıqların yarışını keçirmək olar, amma elə etmək lazımdır orada yüngüllük olmasın. Əgər hansısa kanalda razılaşmadığınız bir şey olarsa, yaxud yaxşı ifaçı kənarda qalıb, əvəzinə pisi ekrana çıxarırlarsa, onda siz etiraz etməlisiniz və bu da sizin mövqeyiniz kimi qarşılanacaq. Bu məsələdə siz tək deyilsiniz. Bununla bağlı Mədəniyyət və Turizm Nazirliyi televiziya kanalları ilə görüşlər keçirir və çalışırlar ki, ümumi proqramlar olsun.

– **Aşıqların geyimi barədə nə deyə bilərsiniz?**

– Mən belə fikirləşirəm ki, burada bir az sərbəstlik olmalıdır. Yaşlı nəsil elə geyinirdi, özü də həvəslə geyinirdilər. Geyim forması haqqında fikirlər var ki, bu, Şah İsmayıl Xətainin dövründən gələn geyimdir. Bizim muğam ifaçılarımızın da geyim formaları var, amma bir də görürsünüz ki, biri geyinmir, biri geyinir. Mənə belə gəlir ki, aşığın o forması təhlil olunmalıdır, tədqiq olunmalıdır, bir az modernləşdirilməlidir. Həm modern, həm də qoy geyimlərdə müxtəliflik olsun. Mən bir fərqlilik görmürəm. Əsas odur ki, oxumağı yaxşı olsun. Eyni zamanda geyimə elə-belə baxmaq olmaz.

– **Aşıqların V Qurultayından sonra Aşıqlar Birliyinin fəaliyyətini necə dəyərləndirirsiniz?**

– Mənə elə gəlir ki, Birlik artıq yaranıb. Sizin artıq oturmağa yeriniz var, jurnalınız çıxır, qurultay keçirildi. Bu qısa müddət ərzində xeyli kitablar nəşr olundu. Elə sizin dünyasını dəyişmiş aşıqlar və sazbəndlərlə bağlı kitablarınız və s. Saytınız fəaliyyət göstərir. Bunlar hamısı işin görüldüyünə sübutdur və görünür ki, Aşıqlar Birliyi mövcuddur.

Hesab edirəm ki, Aşıqlar Birliyində həm mənəvi tərəfindən texniki tərəfinə qədər aşıq sənətini bilənlər var, həm elm adamları var, həm də Azərbaycanda yaxşı potensial var. Tələbkarlıq potensialı da var, elmi-tədqiqat potensialı da, dövlət qayğısı da var və təçkilatçılıq işi də gedir. Bu gün artıq o dedi-qodu yoxdur. Və dedi-qodu yoxdursa, bu, o deməkdir ki, artıq stabilləşmiş, müəyyənləşmiş bir qurum var və bu qurumla da təbii ki, aşıqlar hesablaşacaq. Görəcəklər ki, iş gedir, bu zaman dedi-qodu da olmayacaq.

Yəni artıq görünür ki, Aşıqlar Birliyi işləyir. Yeni dövr üçün yeni bir sistem, yeni model yaranır və bu, elə də asan gedən proses deyil. Bəzən biz düşünürük ki, bu gün bir inqilab olsun. Buna ehtiyac da yoxdur. Gərək onun bazası, strukturu tədricən müəyyənləşsin və o, süni yox, təbii bir qurum kimi işləsin.

– **Maraqlı müsahibəyə görə təşəkkür edirəm.**

**Müsahibəni apardı:**
**Musa NƏBİOĞLU**



***AŞIQ KAMANDAR ƏFƏNDİYEV – 80***

**Zəlimxan YAQUB**
**Xalq şairi**



# AŞIQ KAMANDAR HƏMİŞƏ XALQIN ÜRƏYİNDƏDİR

Sazın, sözün müqəddəs beşiyi qədim Borçalı mahalında bir kənd var – Kürüstü Kəpənəkçi. O kənddə bir ev var – Aşıq Kamandar evi. O kənddə bir muzey var – Aşıq Kamandar muzeyi. O kənddə bir məzar var – Aşıq Kamandar məzarı. O məzarın önündə diz çöküb ağladığım, Aşıq Kamandar evinin ikinci qatında ustadla üz-üzə durub çay kimi çağladığım, o muzeyə baxıb kövrək, dərin xəyallara daldığım bu dünyanın içində ayrıca bir dünya yaşayırdı orda. On bir telli, uzun qollu, gen sinəli, durna boğazlı, bülbül avazlı, yaddaşlarda möhürlənən, könüllərdə sehrlənən Aşıq Kamandar sənətinin və Aşıq Kamandar şəxsiyyətinin yaratdığı Allah vergisi, Tanrı töhfəsi olan bir dünya var idi. Və o dünyada bir Aşıq Kamandar var idi.

*Nələr çəkdi başım, axdı göz yaşım,*
*O gənclik illərim soldu, ay hayıf!*
*Aşıq deyir, ay hayıf,*
*Açan soldu, ay hayıf!*
*Haqdan gələn pozulmaz,*
*Olan oldu, ay hayıf!*
*Yazan yazdı, tərsə çəkdi qələmi,*
*Çoxları bu dərdə daldı, ay hayıf!*

*Mərd igiddən yersiz xata görmədim,*
*Namərd düz oxunu ata, görmədim.*
*Aşıq ata görmədim,*
*Vaxtsız ata, görmədim.*
*Həyatından gileyli,*
*Haqsız ata görmədim.*
*Mən ömrümdə ana, ata görmədim,*
*Yadlar könlüm alan oldu, ay hayıf!*

*Suyu dəhnəsindən arxa bağladım,*
*Səmti-guşəsindən arxa bağladım.*
*Aşıq, arxa bağladım,*
*Arxı arxa bağladım.*
*Nə namərdə sirr verdim,*
*Nə də arxa bağladım.*
*Öz atam oğluna arxa bağladım,*
*Kölgəsi gözündə qaldı, ay hayıf!*

*Kamandaram, mənimlə varalı könlüm,*
*Çox dedim, tutmadı qaralı könlüm.*
*Aşıq, qaralı könlüm,*
*Qəmdən qaralı könlüm.*
*Çalış eldən-obadan,*
*Düşmə aralı, könlüm.*
*Qeyrətsiz qohumdan yaralı könlüm,*
*İllər boyu talan oldu, ay hayıf!*

Aşıq Kamandarı Allah saçından-dırnağına qədər qəm üstə köklənmişdir, göz yaşı üstə köklənmişdir. “Aşıq Qərib” dastanını danışmaqla bütün qəribləri qürbətdən vətənə gətirdi. Bütün Şahsənəmlərin ürəyində sevgi və məhəbbət çırağı yandırdı. “Gülabı” havası üstündə:

*Qızlar, mənə bir təsəlli eyləyin,*
*Güllərim solmadan Qərib gəleydi.*
*Şirin canımı yara qurban eyləyin,*
*Əlim üzülmədən Qərib gəleydi.*

*Çağırın yanıma dərdli anamı,*
*Qərib yoxdu, o bağlasın yaramı.*

*Qadir mövlam özü versin aramı,*
*Peymanım dolmadan Qərib gəleydi.*

– deməklə neçə yüz illərdir oxunan Aşıq Qəribi Aşıq Kamandar yenidən diriltdi. “Ana mən Qəribəm” – Qərib deyəndə bütün analar ağladı qəriblərin halına, bütün qürbətdə olanlar ağladı vətən həsrəti ilə yaşayanlara.



Kamandarı Allah sazından, sözündən, avazından, şeirindən, şeiriyyatından bir layla yaratmışdı, bir nəfəs yaratmışdı. Sehr idi, ovsun idi, möcüzə idi. Onun Səhabəsindən kənara düşmək olmurdu.

*Halaldandı mayam, bulunmaz haram,*
*Qırxlar məclisində mən orda varam.*
*Seyraqub adamla heç olmaz aram,*
*Şeytandır, felindən, ay bu yanda dur.*

– deyəndə artıq Kamandar qırxlar məclisində, ərənlər pirində idi, sıravi yerdə dayanmamışdır. Aşıq şeirinin peyğəmbəri Aşıq Ələsgərin

*Aşıq, diyar-diyar gəzənin,*
*Əzəl başdan pürkamalı gərəkdir.*
*Oturub-duranda ədəbin bilə,*
*Mərifət elmində dolu gərəkdir.*

şeiri elə bil ki, Kamandarın boyuna-buxununa, şəxsiyyətinə, yaraşığına, sazına-sözünə biçilmişdir. Yəni ədəb-ərkan, mərifət, əhli-ürfan, hansı sözün harda deyilməyi. O, yedəhləmə havalarında elə bayatılar işlədirdi ki, adamın ciyərini çəkib eşiyə çıxardırdı. O, yedəhləmələri necə verirdi qoşmaların arasında:

*Neyçün ağlar,*
*Gözlərin neyçün ağlar.*
*Batan karvan mənimdir,*
*Kiradər neyçün ağlar.*

*Yasa bax,*
*Qaralar geymiş yasa bax.*
*Təbiətə borclu canım,*
*Ya bu gündü, ya sabah.*

*Yasınnan,*
*Qara bağlar yasınnan.*
*Çox-çox mənəm deyənin,*
*Dünən gəldim yasınnan.*

*Yer-yemiş,*
*Bağda bitər yer-yemiş.*
*Çox mənəm deyənləri,*
*Torpaq udub, yer yemiş.*

*El yeridi,*
*El yurdu, el yeridi.*
*Mərdin karvanı köçdü,*
*Arxasınca el yeridi.*

Bir dəfə götürdü sazı, bir "Mansırı" (rəhmətlik Təhlə Novruzun sözlərini) oxudu:

*Əgər ki baxmasan, bağçam pozular,*
*Becərsən açılar güllər, əfəndim.*
*Haq deyən dillərə rəvac verilər,*
*Kəsilməz Haqq deyən dillər, əfəndim.*

*Əgər seçən olsa, mərdi, namərdi,*
*Bekar qohumların çəkilməz dərdi.*
*Görüm boş qalmasın mərdlərin yurdu,*
*Gülüşər müxənnət ellər, əfəndim.*



Allah, bunu elə oxudu ki, ikimiz də ağladıq, göz yaşı içində qərq olduq. Birdən mən bir cavanlıq elədim. Aşıq Kamandarın o biri sazını götürdüm, dedim: Ustad, məni havalandırdın, məndə günah yoxdur. Üz-üzə dayanmışıq, ata-oğul kimi, müəllimlə tələbə kimi, şagirdlə ustad kimi, dəryayla damla kimi, amma faktdır ki, üz-üzə dayanmışıq. Bəli, başladıq bu gün artıq dillər əzbəri olan, həm Kamandarın, həm də mənim kitablarımda olan bir deyişmə onda bədahətən belə yarandı. Yadımdadı ki, "Şahsevəni" üstündə oxuduq. İkimiz də çalırdıq, amma elə bil ki, bir sazdı. Bu, o demək deyildi ki, mən də sazı Kamandar kimi çalıram. Xeyr, o, ustad idi, o, məni izləyirdi, mən onu gözləyirdim.

**Zəlimxan Yaqub:**

*Dünya bülbüllü bir bağdır,*
*Sən ötməsən, mən ötmərəm.*
*Bu sehrdən, bu sevdadan,*
*Sən getməsən, mən getmərəm.*

**Aşıq Kamandar:**

*Bu dünya bir güllü bağdır,*
*Sən açmasan, mən açmaram.*
*Söz ətrini bənövşətək,*
*Sən saçmasan, mən saçmaram.*

**Zəlimxan Yaqub:**

*Biz bir eşqin butasıyıq,*
*Gülü gülə tutasıyıq.*
*Bir çəməndə bitəsiyik,*
*Sən bitməsən, mən bitmərəm.*

**Aşıq Kamandar:**

*Od törəyər od canından,*
*Mərd törəyər mərd qanından.*
*Həqiqətin meydanından,*
*Sən qaçmasan, mən qaçmaram.*

**Zəlimxan Yaqub:**

*Qayalar var, qanan mənəm,*
*Qalalar var, yanan mənəm,*
*Səni məndə tapan mənəm,*
*Sən itməsən, mən itmərəm.*

**Aşıq Kamandar:**

*Hikmət var, hikmət doludur,*
*Ulusdan, eldən uludur.*
*Getdiyimiz Haqq yoludur,*
*Sən çaşmasan, mən çaşmaram.*

**Zəlimxan Yaqub:**

*Tər çiçək ollam yazına,*
*Gümüş tel ollam sazına.*
*Zəlimxanam, murazına,*
*Sən yetməsən, mən yetmərəm.*

**Aşıq Kamandar:**

*Kamandaram, həvəsində,*
*Yurd-yuvam var nəfəsində.*
*Ariflərin məclisində,*
*Sən qoşmasan, mən qoşmaram.*

Bəli, bizi muradımıza çatdıran, arzularımıza qovuşduran, qürbətdən vətənə gətirən, oğul evləndirən, qız köçürən, qız nişanlayan, bu gözəl dünyanı sevgi ilə, məhəbbət ilə daha da gözəlləşdirən aşıqlara tarix boyu, zaman-zaman minnətdar olmalıyıq. Aşıq Kamandar ona görə böyük idi ki, böyüklərdən dərsini almışdı. Aşıq Sadıq kimi aşıqların sultanı sayılan pürkamal, divani yükü, dastan yükü əfsanəvi səviyyədə zəngin olan Aşıq Sadıq Sultanovdan dərs almışdır. Telli sazı Tanrı dərgahına qaldıran ulu sazın böyük ustadı Aşıq Əmrah Gülməmmədovdan dərs almışdır. Və o dədələrdən aldığı mayanı, sərvəti bu gün görəcəksiniz. Təbrizdə də, Dərbənddə də, Naxçıvanda da, Borçalıda da, Qarsda da, Göyçədə də, Kəlbəcərdə də, Urmiyada da – hər yerdə də, əgər bu gün saysız dərəcədə aşıqlar ordusu Kamandar yolu ilə gedirsə, onun boğazından oxumağa can atırsa, onun barmaqlarını barmağına köçürmək istəyirsə, bu, o deməkdir ki, Aşıq Kamandar Adəmdən gəlib, Aşıq Kamandar Xatəmə gedir. Aşıq Kamandar kandan gəlib, Aşıq Kamandar məkana gedir. Aşıq Əmrahın məzarı başında sözümün sonu bundan ibarət idi:

*Deməyin ki, vaxtı başa yetirdik,*
*Tar kamansız, kaman tarsız qalmasın.*
*Aman, ellər, xan Əmrahı itirdik,*
*Sənət mülkü Kamandarsız qalmasın.*

Bəli, həyat təsdiq elədi ki, böyük sənətkarı Allah böyüdür, xalq böyüdür. Millət də bizi böyüdüb, vətən eşqi böyüdüb. O, həmişə xalqın ürəyində olur. Necə ki, Aşıq Kamandar həmişə xalqın ürəyindədir.

Bəli, bu gün biz öz böyük sənətiylə, şəxsiyyətiylə Azərbaycanın aşıq sənətinə böyük şöhrət və nüfuz gətirən, bütün aşıq məktəblərinin böyük sənətkarlarının hamısını ehtiramla yad eləyib, onların müqəddəs ruhu qarşısında baş endiririk. Dədə Qorquddan dədə Şəmşirə, dədə Ələsgərə, Aşıq Hüseyn Saraclıya, İmrana, Əkbərə, Mikayıl Azaflıya, Şakirə, Pənaha, Xanlara, adını çəkmədiyim böyük ustadlar var onların hamısının müqəddəs ruhuna eşq olsun ki, bu xalqın ruhunu sazında, sözündə, ləngərli məclislərində həmişə diri və duru saxlayıblar.

## AŞIQ KAMANDARA MƏKTUB

*Ağrını, azarı qoyma yaxına,*
*Durma, usta tərpən, usta Kamandar.*
*Tutular gözlərim, yanar ciyərim,*
*Görsəm o telləri pasda, Kamandar.*

*Bəzəsin məclisi söhbətin xası.*
*Qoyma göz açmağa nisgili, yası.*
*Amandı, quyudan qurtar Abbası,*
*Saxlama Gülgəzi yasda, Kamandar.*

*Sazdı, havacatdı könlümün yarı,*
*Odur Zəlimxanın dövləti, varı.*
*Beş gün ömrüm olsa, bölərəm yarı,*
*Verrəm sənin kimi dosta, Kamandar.*

## KAMANDARIN ÖLÜMÜNƏ

*Qəfil bir xəbərdən dondum yerimdə,*
*Səni nə tez çəkdi gor, ay Kamandar.*
*Elə bil üstümə dağlar yeridi,*
*Calandı yerimə qor, ay Kamandar.*

*Ağladım mən səni xəstə görəndə,*
*Qəlbini dumanda, sisdə görəndə.*
*Səni çiyinlərin üstə görəndə,*
*Gözüm kor olaydı, kor, ay Kamandar.*

*Dədələr zinətdi təbiət üçün,*
*Həm xalq üçündür, həm sənət üçün.*
*Nə qədər ağlayaq bu millət üçün,*
*Çoxdu dizlərimə zor, ay Kamandar.*

*Şaxtaya, bürküyə, ayaza baxmır,*
*Baş vurub dərinə, dayaza baxmır.*

*Səsə, zənguləyə, avaza baxmır,*
*Əcəl toxuyanda tor, ay Kamandar.*

*Saraclı qurduğu o dərgah hanı?*
*Hanı Xındı Məmməd, xan Əmrah hanı?*
*Aşıq Sadıq kimi məğrurlar hanı?*
*Nələr itirmişik gör, ay Kamandar.*

*Niyə dərdə düşüb, qəmə batırsan,*
*Yenə Zəlimxana nazmı satırsan.*
*Yatmaq vaxtıdımı, hara yatırsan,*
*Yanına el gəlib, dur, ay Kamandar.*

***3.12.2000***





***Aşıq Kamandarın aşıqlığı və ilhamı saz poeziyasının çox dərin qaynaqlarından süzülüb gəlir. Onu dinləyəndə hələ bu vaxtacan tam azərbaycanlı ola bilmədiyimi daha aydın dərk edirəm, vaysınıram. Məgər saz çala bilməyəni, bu boyda mədəniyyəti yalnız seyrçi kimi dinləyəni də azərbaycanlı adlandırmaq olar?***

**Xəlil Rza ULUTÜRK**
**Xalq şairi**

* * *



Unudulmaz, böyük ozanımız, məşhur Aşıq Kamandarın xatirəsi qarşısında ehtiramla baş əyirəm. Sənət dünyasına gələn istər şair olsun, istər bəstəkar olsun, istərsə də aşıq olsun, ilk növbədə Allahın verdiyi istedadla gəlir, Tanrı payı ilə gəlir. Allah Kamandara o qədər böyük istedad, o qədər böyük sənət səadəti vermişdi ki, onu təqlid etmək qeyri-mümkündür. Qədimlərdə deyirdilər ki, Allah sevdiyi bəndəsinə ahəng duyğusu verir, ahəng hissi verir, musiqi duyğusu verir. Bu mənada Aşıq Kamandar Allahın seçilmiş sevimli bəndəsi olub. Kamandar təkcə ozan-aşıq deyildi, eyni zamanda yaxşı şair idi. Kamandarın, doğrudan da, səsi, sazı, sözü bir-birini gözəl tamamlayırdı. Kamandarın birinci kitabı çıxdı, sonra isə ikinci kitabını hazırladılar. Amma çox hayıf Kamandar ikinci kitabını – "Bənövşə" kitabını görmədi. İndi isə üçüncü kitabı – "Mən ellər aşığı Xan Kamandaram" kitabı çıxıb.

Kamandar, doğrudan da, əvəzolunmaz sənətkardır. Sənət qədər insanları birləşdirən qüvvə yoxdur. Çünki sənət məhəbbət dünyasıdır. Sənət həyatı təsdiqləyir, sənət gözəlliyi təsdiqləyir. Bu millət də gözəllik duyğusuna alışmış millətdir. Gözəlliyi sevən, həyatı sevən, yaşamağı, yaratmağı sevən bir millətdir. Ona görə birlik naminə aşıqlarımızı, şairlərimizi, sənətkarlarımızı təbliğ edirik.

Belə sənətkarları yad eləmək o deməkdir ki, biz xalq başlanğıcını yaşadırıq. Bu, o deməkdir ki, biz özümüzə qayıdırıq. Ustadın ruhu şad olsun.

**Camal MUSTAFAYEV**
**professor**



Aşıq Kamandar o aşıqlardandır ki, sənətin, düşüncənin, mədəniyyətin daşıyıcılarından olub. Onda fitri istedadla yanaşı aşıq sənətinin, aşıqlığın böyüklüyünü mühafizə, müdafiə etmək gücü olub. O, ustad-şəyird ənənəsinə riayət edən aşıqlardan idi. Sovet dövründə aşıqlığın ruhunu, mahiyyətini, özünəməxsusluğunu gendən, kökdən gələn enerji ilə qoruya bilib. Bu cəhətdən onun ruhu çox qədim dövrlərdən gələn ruhdur. Eyni zamanda yaxşı müəllim, yaxşı ustad olub. Və onun müəllimliyi, onun təsiri yalnız şagirdlərinə keçməyib. Onunla heç bir kontaktda olmayanlar da ondan öyrənib. Onun yaradıcılıq imkanı, yaradıcı şəxsiyyəti, istedadı... Elə istedad var ki, o, istedad öyrətmir. Amma Aşıq Kamandar öyrənilmiş, təqlid olunmuş və bu gün təqlid olunmaqda olan aşıqlardandır. Onun rahat, bir az da nazlı ritmləri var, sözündə də elədir. Bəlkə də Aşıq Kamandarı ona görə çox sevirlər ki, əsasən, bizim nəsil ona görə sevir ki, bizim bu aşıq sənətinin gözəlliyi ilə bağlı sözündən musiqisinə qədər, ciddiyyətindən zarafatına qədər onun şəxsində biz tərbiyə almışıq. Bax buna görə Aşıq Kamandar bizim üçün doğmadır, həm peşəkarlıq baxımından, həm də sənətdən zövq almaq baxımından. Ona görə həmişə kimsə oxuyanda onda Aşıq Kamandarın ruhunu tapa bilirik. Ustadın mükəmməl rolu var, öz obrazını yaratmış adamdı. Belə aşıqlar çox az oldu. Məsələn, Aşıq Ədalət, Mikayıl Azaflı, Aşıq Kamandar, onlardan əvvəlki nəsildə Aşıq Şakir, Aşıq İmran. Yəni bu aşıqların içərisində Aşıq Kamandar həm şairdir, həm aşıqdır, həm mütəfəkkirdir, həm də onun şəxsiyyətində bir doğmalıq, bir mistika var idi.

**Nizami CƏFƏROV**
**AMEA-nın müxbir üzvü,**
**Millət vəkili.**



***Əgər Əmrah Gülməmmədov sehrli barmaqları ilə, Hüseyn Saraclı şirin dastan deyimləri ilə qəlbləri fəth edirdisə, Aşıq Kamandar təkrarsız məlahətli səsi ilə könülləri məst edirdi. O, insanların qəlbini ələ almağı bacarırdı. Onda olan məlahətli səs, təkrarsız səs fərdi xüsusiyyətdir. Hələ ki, mən bunu başqalarında görmürəm.***

***Aşıqlar dastan danışanda sazın səsini yavaşca dınqıldadırdı ki, səsi qarışmasın. Amma Kamandar qədər bu məsələdə irəli gedən ikinci bir aşığımız yoxdur, kim nə deyir desin. O, havanı çalır, hava da öz yerində olur dəyişmir, bir simdə səhvə yol vermir. Hava da öz yerində gedirdi, onun danışığı da. Onun şagirdləri də burada çıxış elədilər. Onlardan biri də Cahangirdir. Onlarda da bu xüsusiyyət var, amma Kamandar deyil.***

**Həsən MİRZƏ**
**professor**

*** 

**USTAD AŞIQ**
**KAMANDARIN XATİRƏSİNƏ**

*Hökm edib dağlara, hökm edib Günəş,*
*Uca zirvələrdən bəyaz qar gedib.*
*Qüssədən ağaclar töküb yarpağın,*
*Meyvəli bağlardan şirin bar gedib.*

*Dəyişib mahalın abı-havası,*
*Ötmür bülbülləri, üzmür sonası.*
*Ölübdür ellərin erkək anası,*
*Arzusu gözündə ahu-zar gedib.*

*Qəlb iman beşiyi, gözüsə Allah,*
*Verib nur yatağı üzüsə Allah,*
*Sazı Kəbə bilib, sözüsə Allah,*
*Ellər qayğıkeşi bir zəvvar gedib.*

*Təbrizəm, dərsimi Mövlandan aldım,*
*Sözlə kainatı lərzəyə saldım.*
*Bir günün içində yüz il qocaldım,*
*Nə vaxt ki, eşitdim Kamandar gedib.*

**Təbriz İman DARVAZLI**



Böyük Şəhriyar "Heydər babaya salam" poemasında deyir:

*Heydər baba, dünya yaman dünyadı,*
*Süleymandan, Nuhdan qalan dünyadı.*
*Oğul doğub dərdə salan dünyadı,*
*Hər kimsəyə hər nə verib alıbdı,*
*Əflatundan bir quru ad qalıbdı.*

Dünya hər kimə hər nə verir, onu alır. Xoşbəxt o adamlardır ki, ondan ad qalıb. Çünki çox az adamdan ad qala bilər. Adamlar var, sağdır, həyatda yaşayır, amma ölüdən fərqi yoxdur. İnsanlar var, ölümündən iyirmi il keçir, otuz il keçir, amma onun haqqında danışılanda hamı sanki sağ adam haqqında danışır və boğazdan yuxarı danışmır, ürəkdən danışır. O insanlar xoşbəxt insanlardır. Mən hesab edirəm ki, böyük Kamandar, xan Kamandar xoşbəxt insanlardan olub ki, bu gün həyatda olmasa da, nə qədər insanlar onun sənətindən, onun sözündən, onun şəxsiyyətindən danışırlar. Və danışanların hamısı da ürəkdən danışır, elə danışır ki, elə bil xan Kamandar, böyük Kamandar özü bizim aramızdadır. Bu, hər sənətkara, hər ustada qismət olmur.

**Qənirə PAŞAYEVA**
**Millət vəkili**





Aşıq Kamandar Azərbaycan aşıq sənətində heç kəslə müqayisə olunmayan bir ustaddır. Yəni Aşıq Kamandarın şagirdlərinin sayı nə üçdür, nə beşdir, nə də on beşdir. Bugünkü Azərbaycan aşıqlarının tam tən yarısı Kamandarın şagirdləri statusundadır. Mən bunu bütün məsuliyyətimlə söyləyirəm. Kamandar Əfəndiyevin ləmisi, boğazı, çalğı tərzi bütövlükdə öncə Borçalını, sonra Azərbaycanı – Şimali Azərbaycanı, Cənubi Azərbaycanı, Anadolunu öz təsiri altına saldı. Bir sözlə, Təbrizə gedirik bir istedadlı aşıq oxuyur – Kamandar ləmisi ilə, Kamandar boğazı ilə. Urmiyada, Zəncanda, Qarsda – hər yanda bunu görürük. Soruşursan, sənin ustadın kimdir, deyir: "Ustadım Aşıq Kamandardır". Aşıq Kamandarı görmüsənmi, – görməmişəm. Hardan ustadın olubdur? "Bütün lent yazıları, televiziyadan gördüyüm ən müxtəlif Kamandar ifaları" – deyir. Yəni Kamandarın sənətinin o qədər böyük ecazı var ki, birbaşa özü olmadan sənəti ilə müəllimlik edir, çalğısı ilə müəllimlik edir. Mən dəfələrlə demişdim, o, Qəribi danışanda, doğurdan da, Qəribin özü olurdu. Qurbanini danışanda Qurbani olurdu, Abbası danışanda dönüb Abbas olurdu, Xəstə Qasımdan danışanda Xəstə Qasım böyüklüyü, ucalığı, əzəməti gəlirdi. Bu mənada Kamandarın sənət möcüzəsi əsrlərin, qərinələrin, yüz illərin o tayından – düz Dədə Qorqudun məkanından, Dədə Qorqudun məqamından başlayır. Və bu günlərə o gücü, o qüdrəti böyük şərəflə, ləyaqətlə daşıyıb gətirir. Kamandar sənətinin ecazının o qədər böyük qüdrəti var ki, mən tam əminliklə deyə bilirəm ki, Dədə Qorquddan gələn o böyük sehrli gücü yüz illər, qərinələr sonrasında eyni məlahətlə, güclə daşıyacaqdır. Bu gün burada təkcə ustad Kamandarın yox, üzü Dədə Qorquddan bəri Qurbaninin, Abbas Tufarqanlının, Xəstə Qasımın, onun özünün yanında olan nəhəng Borçalı dağları Əmrah Gülməmmədovun da, Hüseyn Saraclının da ruhu şaddır. Bu baxımdan Azərbaycanımızın bugünkü Kamandar saz bayramı mübarək olsun. Ustadın ruhu şad olsun.

**Məhərrəm QASIMLI**
**professor**

# KAMANDAR CAN DEYİR ANA TƏBRİZƏ



Türk dünyasının böyük ozanı ustad aşıq Kamandardan söz düşəndə mənim xəyalımda saz-söz və musiqi qanadlı xatirələrim, duyğularım canlanır. "Xəstə Qasım kimə qılsın dadını, canı çıxsın özü çəksin odunu" misralarının söz sanbalıyla yanaşı, qırımlı bir səs sanbalı, səs həzinliyi ürəyimin, canımın, nə bilim, bəlkə də beynimin dərinliklərində nələrisə oyadır! Türkün ozan Kamandarının səsində, avazında səslənən bu Xəstə Qasım kimdir? Görəsən, hardadı bu Tikmədaş deyə, vaxtilə özüm bilirəm nə qədər xəyallara cummuşam! Mən onda elə başa düşürdüm ki, Borçalı Bakının beş addımlığında yerləşən bir mahaldır və Tikmədaş da Borçalının kəndlərindən biridir! Və öz-özümlə belə bir arxayınlığa çatmışdım ki, əgər belə olmasaydı, bu ozanın sinəsinə neçə-neçə dastanlarla yanaşı, şair Nəbilər, Ağacanlar, Səməd Vurğunlarla yanaşı, bu qədər ərköyünlüklə baş qoyub yatmazdı qatar-qatar Xəstə Qasım Tikmədaşlı, Abbas Tufarqanlı sözləri! İllərcə Aşıq Kamandar səsinin sehrli laylalarında belə düşünməyə başladım. Və o ustadlardan, Kamandar avazında hər eşitmədiyim bir başqa söz səslənəndə: "Xəstə Qasım qalıb naçar, sirr sözünü kimə açar", "Xəstə Qasım can üstədir" – mənim arxayınlığımın arxayınlığı daha güclənirdi və güclənməkdən başqa çarəsi yox idi! Mən hardan bilərdim bildiklərim düz deyil? Tikmədaşdan Borçalıya gedən yolların uzaqlığı çox da az deyilmiş, sən demə!... Yerlə getsən, qarşına Arazlar çıxarmış, göylə getsən, göylərində nələrdənsə qaralmış, dolmuş buludlara toxunarmış başın!.. Mən hardan bilərdim bildiklərim düzdür? "Aşıq dili yüyrək olar", səni yerdən-göydən, ayrı bir yerlə-göylə aparıb, gətirər, görüşdürər, ayırar! Mən hardan biləydim? Hansı məktəblərdən, hansı dərsliklərdən, hansı öyrətmənlərdən öyrənəydim? Axı "mən" ki, axı "biz" ki sonu almasız qurtaran nağıl oğulları kimiydik dünyanın quzeysiz güneylərində!...

Mən sonralar bildim ki, türk ellərinin genişliyi, axar-baxarı çox da belə asanlıqla əlçatan, ünyetən deyil. Və sonralar bildim ki, Borçalı Bakının qulağının dibində deyil, beş addımlığında deyil və bildim ki, "Tikmədaş" Borçalının kəndlərindən biri deyil. Və sonralar bildim ki, hər yetən, hər saz götürüb söz deyən aşıq olmaz və sonralar bildim ki, hər aşıq da "Kamandar" olmaz...

Tehrandan üzü Təbrizə, Qaradağa və İskanlıya doğru gəldiyim səfərlərin, günlərin birində Xəstə Qasımın mahalı "Bostanava" və kəndi "Tikmədaş"ın yanından, elə-beləsinə keçə bilmədim. Ustad Kamandar yadıma düşdü. Xəstə Qasımı yadıma saldı. "Ustadnamə"lər, "Dübeyti"lər, "Koroğlu dübeytisi", "Paşa köçdü"lər məni döndərdi Tikmədaşa, Xəstə Qasımın məzarına baş vurmağa. Könlümdəki abad şəhəri gözümlə nə talan gördüm, İlahi! O soyuq məzarlıq da, Xəstə Qasımın torpaqdan seçilməyən başdaşı da sanki deyirdi: "Xəstə Qasım kimə qılsın dadını". Qəribə suallar doğdu beynimdə: Bu daşdan-torpaqdan seçilməmək nə, türkün böyük ozanı Kamandarın səsində, avazında şahlanma nə! Nədir bu sehr, bu sirr?

O hisslər hələ beynimdə qıvrılıb yatmışdı ki, bir gün kəndimiz İskanlıdan Kələybərə gedən yolun yarılığında, "Soyuqbulaq" deyilən bir bulaqdan düşüb su içmək istəyərkən, bulaqdan bir az yuxarıda qoyun sürüsünü meşə ətəyi yaşıllıqlara səpələyən bir uşaq çobanın zümzüməsi məni ondan bu sualı sormağa məcbur etdi: Yaxşı oxuya bilirsənmi, qağa? Aşıq oxumalarından xoşun gəlirmi? Durmadan cavab verdi: "Xoşun gəlir nədi? Aşıq Kamandarın ölüsüyəm". Onun belə gözlənilməz cavabı məni heyrətləndirdi! İranda, Güney Azərbaycanın Qaradağ mahalının ucqar bir kəndində balaca bir uşaq deyəndə ki, mən aşıq Kamandarın xəstəsiyəm, Gürcüstanda Borçalı mahalının Kürüstü Kəpənəkçi kəndində Xəstə Qasımdan oxuyan türkün böyük ozanı Aşıq Kamandar böyüklüyünün sirrini tapmış kimi hisslər yaşadım. Bu, necə sirlərdir! Bu, nə ölməzlikdir, bu, nə körpülərdir, hansı qandan, candan, ürəkdən, birlikdən, haralardan keçir bu yol, bu yollar? Duya bilsən də, deyə bilməzsən, qardaşım!...

"Mən burda nələr gördüm" – deyə, bir lent yazısında Aşıq Kamandarın sevimli oğlu Əflatunun və onun davamçısı Raminin güneyə gəlib, Aşıq Kamandarın ağlagəlməz dərəcədə sevilməyindən heyrət-lənməyini gördüm. Mən Əflatunun heyrətini görəndə öz-özümə deyirdim: Ay Əflatun qağa, sən gördüyündən çox görmədiklərin var. Sən hələ nələr görmüsən Aşıq Kamandar sevgisindən. Yağış kimi səpələnib Kamandar sevgisi güneydə – Qaradağda. Bunu Azərbaycanın quzeyindən güneyinə gələn hər aşıq toy məclislərində gözüylə görür və canıyla hiss edirdi. Və bəzən bu sevgi selinin qabağında kötüklənmək istəyənləri bu sel özüylə götürüb aparırdı, neçəsini gözümlə gördüm! Baxmayaraq ki, çoxları da "günəşi danmaq olmaz" – deyə, Kamandar sənətinin böyüklüyünü etiraf edirdilər.

Mənim Kamandar adında yaşıdım var, ustad Kamandar sevgisiylə qoyulan adlardan biridir. Adam tanıyıram ki, bir maşında oturarkən, "Aşıq Kamandardan bir lent qoy oxusun, qulaq asaq" – deyə, sürücüyə

üz tutur. Sürücü: – "Kamandardan yoxumdur, ayrı bir musiqi açaram sənin üçün qulaq asarsan" – deyəndə: "Yox qardaşım, bağla, yadımdan çıxmışdı, mən yaslıyam qulaq asammaram", – deyir. Kamandar sənətinin sehri bu qədər qorxulu sevgilərə gətirib çıxarıb çoxlarını! Qoy qulağı eşitməsin bu sözləri dünyada yalandan fanat tükanı qoyanların...

Mən vaxtilə çox düşünürdüm ki, keşkə Aşıq Kamandar gələ biləydi bu ellərə, "Aşıq Kamandarın qürbət diyarda xan Təbrizi qaldı, Arazı qaldı" – dediyi ellərə. İndi hərdən düşünürəm ki, bəlkə də, nə yaxşı ki gəlmədi, gələ bilmədi. Arzulardan arzulara, əlçatmazlıqlara köçdü, getdi o ustad. Axı bizim taleyimizin həsrət dadı görüş dadından dadlı olub çox zamanlar, qoy bu da qoşulsun o yüzlərin birinə. Səsi, avazı, sözü gəldi, on bir telli sazı gəldi, elə bil özü də gəlib. Kamandar sənəti dünyanın bütün ölməz sənət əsərləri kimi bizim ruhumuzun əbədi qonşusudur. Sənətkar əgər sənət ölməzliyi ilə hopmasaydı ürəklərə, yəqin dünyanın Məmməd Arazları deməzdi: "Məni şeirimdə gəz bir insan kimi!"

Onun vaxtilə ölüm xəbəri də Güneyi silkələdi! Qaradağın və Azərbaycanın sevimli aşığı Məhbub Xəlili "məni dostlarım ovutmasaydılar, bağrım çatlardı. Aşıq Kamandarı görmək böyük arzularımın biri və görməməyim böyük həsrətlərimdən biri oldu", – deyirdi.

Hər ustad aşıq Aşıq Kamandar qədər yeni havalar yaradıb qoşsaydı, havalarımıza, bəlkə də, yetmiş iki sərhədləri çoxdan aşıb getmişdik neçə yüzlərə doğru. Görünür, bu da hər ustad istedadına qismət olmamış. Bəstəkarlıq istedadı hər aşığa üz tutub "o dəftərə məni də yaz" deməmişdir. Camal Mustafayev çox düzgün qeyd edir: "Kamandarın zəngin sənətində saz, səs, söz vəhtəddədir". Məncə, sazdan, səsdən və sözdən ayrı deyilməsi çox da asan olmayan yönlər var ki, Kamandar sənətini günü-gündən sevdirir. Kamandarı təkcə sevmək və onu təkrarlamağa çalışmaq və təqlid etmək kifayət deyil. Onun sənətinin sehrini, sirrini və bütün görünməyən yönlərini axtarıb, arayıb tapmaq lazımdır, çünki aşıqlığa gərək olan, bütün şərtləri özündə birləşdirən, ustad aşıq Kamandar olan yerdə, "Kamil aşıq necə olar?" – sualı, heç vaxt cavabsız deyil.

Mən sözümü, türkün ozan Kamandarını anarkən, onun Güney Azərbaycanda birinci dönə "Borçalı laylası" kitabını işıq üzünə çıxarıb geniş oxucu kütləsinə və Kamandarsevənlərə təqdim edən dostum, qardaşım Məmməd Məhmudiyana üz tutaraq dörd il bundan öncə yazdığım "Payız yağışı" adlı şeirimlə bitirirəm və düşünürəm ki, dədə Kamandarın "Kamandar can deyir ana Təbrizə" misrasındakı "CAN" sözü indi qoca Təbrizin silsilə Qaradağlarına dəyir, min cana dönür, qayıdır Borçalıya, dünyaya və türkün sazlı-sözlü ozan ruhlarına.

*Bir bulud qıvrılır göy üzlərində,*
*Hardasa bir yarpaq sozalır, bəlkə.*
*Yuxusu pozulur dənizlərin də,*
*Hardasa bir meşə azalır, bəlkə.*

*Payız nağılların sarı gəlini,*
*Göylər qurşağıyla bağlar belini.*
*Tökür durnaları yarpaq telini,*
*Əlləri əllərdən üzülür, bəlkə!*

*Yağ payız yağışı, yağ narın-narın,*
*Yaşıl istəyisən bu son baharın.*
*Ruhunda yaşıllıq yaşadanların,*
*Taleyi yağışla yazılır, bəlkə.*

*Qaytar bu çayların perikmiş gücün,*
*Daşı bu ellərdən payızlıq köçün.*
*Güllər güllüyünə qayıtmaq üçün,*
*Dənizlər göylərdən süzülür, bəlkə.*

*Sən ol yağışların daha göyçəyi,*
*Bitir Borçalıda Təbriz çiçəyi.*
*Kamandar sazının gümüş ləçəyi,*
*Bütün sinələrə düzülür, bəlkə.*

*Başımda dəlisov bir arzu gəzər,*
*Arzum arzusuna tamarzı gəzər.*
*Göylərdən tökülür, deyəsən, Xəzər,*
*Dünyamız paklanır, düzəlir, bəlkə!...*

**Əli Cavadpur İSKANLI**
***Xudafərin***



**Sabir ƏLİYEV**

## AŞIQ KAMANDARA

*Sazını çalsana, şövqə dolsana,*
*Könlümü alsana, dilinə qurban!*
*Qeydimə qalsana, haray salsana,*
*Qalxıb ucalsana, zilinə qurban!*

*Heyranam hayına, həm harayına,*
*Alqış söz tayına, söz humayına.*
*Toy düşüb payına, haqqı-sayına,*
*Sevdalı ayına, ilinə qurban!*

*Sazında "Sultanı" tutar dünyanı,*
*Səsində "Hicrani" yıxar insanı.*
*Sağaldar "Ürfani" xəstə vicdanı,*
*Ay elin loğmanı, əlinə qurban!*

*Ey haqda Nəsimi, ruhun həkimi,*
*Çal, oxu səmimi səhərə kimi.*
*"Fəxri"yə çək simi, qaynat eşqimi,*
*Kəsmə "İbrahimi", gülünə qurban!*

*Sözdə Kamandarsan, bəstədə varsan,*
*Sənətdə meyarsan, sazda əyarsan.*
*Sabirə vüqarsan, ellərə yarsan,*
*Özgə sənətkarsan, telinə qurban!*

## KAMANDARA

*Ay mənim halımdan hali sənətkar,*
*Demə saçlarına niyə qar düşüb.*
*Ay sənət mülkünə vali sənətkar,*
*Könlümə əyyamdan qəm-qübar düşüb.*

*Ovubdur könlümü zalım tişəsi,*
*Dərindir sinəmdə qəmin rişəsi.*
*Özgənin baxtına var əndişəsi,*
*Mənim də payıma ahu-zar düşüb.*

*Vaxtında düşübdür vaxtına Şərqi,*
*Çıxıbdır möhnətin taxtına Şərqi.*
*Aşıq Kamandarın baxtına Şərqi,*
*Şərqinin baxtına Kamandar düşüb.*

***Ustad aşığın yaradıcılığından nümunələr***

**Aşıq Kamandar ƏFƏNDİYEV**

## TELLİ SAZDADI

*Sözlə bəhrələnən qoca dünyanın,*
*Eşqinin havası telli sazdadı.*
*Səfalı bağların, uca dağların,*
*Təsviri, boyası telli sazdadı.*

*Dədə Qorqudumun göynəyən səsi,*
*Ulu babaların qəm şikəstəsi.*
*Telli durnaların həzin nəğməsi,*
*Bülbülün nəvası telli sazdadı.*

*Qüdrəti güclüdür insan ağlının,*
*Həyata bağlının, zata bağlının.*
*Misri qılınc çəkən qoç Koroğlunun,*
*Nərəsi, qovğası telli sazdadı.*

*Yanan Kərəmlərin, sönən şamların,*
*Ölümlə çarpışan qəhrəmanların.*
*Kitablar bağlanan min dastanların,*
*Aləmi, dünyası telli sazdadı.*

*Vətən məhəbbəti, el məhəbbəti,*
*Dostluq məhəbbəti, könül həsrəti.*
*Ustad nəsihəti, sözün qüdrəti,*
*Hər dərdin davası telli sazdadı.*

*Zirvəli dağları aşıb sədası,*
*Üzeyir, Fikrətin sənət dünyası.*
*Könüllər fəth edir hər simfoniyası,*
*Onun da mayası telli sazdadı.*

*Aşıq Kamandaram, dedim hər zaman,*
*Sazın hikmətini nadandı danan.*
*Gecələr yuxusu gözündə yanan,*
*Analar laylası telli sazdadı.*

**OXU**

*Aşıq, ilhama gəl, məclis oyansın,*
*Divani, təcnis de, həzindən oxu.*
*Ustad Ələsgərdən, Xəstə Qasımdan,*
*Dastanlarda olan dözümdən oxu.*

*De şair Nəbidən, Təhlə Novruzdan,*
*Şair Ağacandan, şair Knyazdan.*
*Şair Zəlimxantək coşqun avazdan,*
*Dədəmiz Əmrahın sazından oxu.*

*De Alyar müəllimin şirin dilindən,*
*Həsən Məcruh necə küsdü gülündən.*
*Bir xəbər ver Lejbəddinni elindən,*
*Şair İbrahimin sözündən oxu.*

*Vurğunu ellərdən sor, an, unutma,*
*Osman Sarıvəllini bir an unutma.*
*Dilində əzbərdi Quran, unutma,*
*Keşəli Osmanın özündən oxu.*

*Başı ağ çalmalı uca dağların,*
*Lilparlı, yarpızlı tər bulaqların.*
*Bizim Qaraxaçın, göy yaylaqların,*
*Şehli çəmənindən, düzündən oxu.*

*Zirvədə qartalın məğrur səsindən,*
*Yerdə köhlən atın kişnəməsindən.*
*Türfə gözəllərin gülüşməsindən,*
*Oğrun-oğrun baxan gözündən oxu.*

*Səyyad əl çəkərmi belə peşədən,*
*Lalədən, nərgizdən, tər bənövşədən.*
*Səkib qayalardan, keçib meşədən,*
*Xınalı kəkliyin izindən oxu.*

*Nədir özün bizə belə istədən,*
*Havadırmı, kababdırmı məst edən.*

*Çoban qardaş karıxıbdı tüstüdən,*
*Yanar ocağından, közündən oxu.*

*Dumanda at minən dağlar qızından,*
*Pörtmüş uşaqların şəhla gözündən.*
*Xanım nənələrin körəməzindən,*
*Norundan, şorundan, üzündən oxu.*

*Aramsız yağışlar yağanda narın,*
*Şənlənər qonağı alaçıqların.*
*Sağda yuxa salan gül yanaqların,*
*İsti çörəyindən, duzundan oxu.*

*Xəyalən nəzər sal bəndə-bərəyə,*
*İnsafdırmı gözəl canlar çürüyə.*
*Keçən günlər bir də gəlməz geriyə,*
*Bəzini yada sal, bəzindən oxu.*

*Bir nəsihət desin Aşıq Kamandar:*
*Hər üzə gülənə aldanma zinhar.*
*Ürəkdən sifətə incə bir yol var,*
*Qəlbin paklığını üzündən oxu.*

## ATALAR

*Yeri cənnət olsun, nur ilə dolsun,*
*Sözüylə dağları əyib atalar.*
*Nə bir müxənnətə meydan veribdi,*
*Nə namərd çörəyin yeyib atalar.*

*Əli yüz də çatsa zərə, daş-qaşa,*
*Qızıldan saraylar yapdırsa qoşa.*
*Gədadan bəy olmaz, poşadan paşa,*
*Nə gözəl yerində deyib atalar.*

*Əsl bəylər el çırağı yandırıb,*
*Mahal dolandırıb, el dolandırıb.*
*Hər xeyirdə, şərdə mərdana durub,*
*Onu alqışlayıb, öyüb atalar.*

*Birlik olub yaylaqlara köçəndə,*
*Ağsaqqallar yurd yerini seçəndə.*
*Elin adətindən kənar keçəndə,*
*Qəzəb libasını geyib atalar.*

*Kamandar, gördüyün sənələr keçdi,*
*Sənətin boranlı dövrana düşdü.*
*Gördülər katdalıq çox müşkül işdi,*
*O gündən oldular qeyb atalar.*

**OĞUL**
(Nəsihətnamə)

*Layiq görüb səni başa çəksələr,*
*Meydanında cəsarətlə dur, oğul.*
*Vətəninə qartal kimi sinə gər,*
*Xalqın olar sənə kömək, yar, oğul.*

*İstərəm olasan misli İsgəndər,*
*Vətən torpağına dəyməsin xətər.*
*Bilsinlər güneydən quzeyə qədər,*
*Adın olsun ölkələrə car, oğul.*

*Sən də Koroğlu ol, dosta gərəkli,*
*Ocağı qonaqlı, duzlu, çörəkli.*
*Ancaq heç vaxt olma yumşaq ürəkli,*
*Yağıları kəlləsindən vur, oğul.*

*Dözümlü ol, dözümsüzə ar olsun,*
*Təmiz ürək sinələrdə var olsun.*
*Hər işiniz, əməliniz bir olsun,*
*Yenilikdə bir yenilik qur, oğul.*

*Kamandaram, tanı ozan dədəni,*
*Haqq saxlayar düz yoluyla gedəni.*
*Qeyrət ilə qoru, saxla vətəni,*
*Düşmən olsun qabağında xar, oğul.*

## GÖZƏL

*Əzəli Allah yaradıb,*
*Beyi-binadan gözəl.*
*Salavatın sahibidi,*
*Nur üzü nurdan gözəl.*
*Kəlmə-kəlmə ayə endi,*
*Bax Rəsulun şaynına.*
*Tər İslamın tərbiyəsi,*
*Otuz cüz Quran gözəl.*

*Oxuduqca nur çiləyir,*
*Ayələrin danəsi.*
*Hesabatda dörd altıdı,*
*Yüz on dördün xanəsi.*
*Böylə bir elmi dəryanın,*
*Nurdandı pərvanəsi.*
*Onu münəvvər yaradıb,*
*Böyük Yaradan, gözəl.*

*Ay Kamandar, tər İslamın,*
*Tər dünyası kimdə var.*
*Tur Sinanın möcüzatı,*
*Öz hikməti kimdə var.*
*Mehrac evinin səfəri,*
*Şah mirzəsi kimdə var.*
*Övliyalar, əmbiyalar,*
*Qadir- sübhan gözəl.*



## GEDİR

*Gələn günə çox tələsmə,*
*Gedən gün sənnən gedir.*
*Qışı, yazı, yay, payızı*
*Ömürdən, gündən gedir.*
*Cavanlığı fövtə vermə,*
*Qoy bilsin ellər səni.*
*Gözüaçıq, aqil olan,*
*Həyatda önnən gedir.*

*Dünya özü sehirkardı,*
*Nəticəsi bilinməz.*
*Döngəliynə fikir versən,*
*Qətrə qanın ilinməz.*
*Ömür var ki, tarixlərin*
*Yaddaşından silinməz.*
*Ömür də var mehə dönər,*
*Dumannan, çənnən gedər.*

*Kamandarın arzusudu,*
*Qönçə xara düşməsin.*
*Eşqidə məcnun olanlar,*
*Bəxti qarə düşməsin.*
*Dövranında usta tərpən,*
*İşin dara düşməsin.*
*Gen günündə can deyənlər,*
*Dar gündə gendən gedər.*



### *YOLUM VAR MƏNİM*

*("Aşıq, deyirlər siz varlı*
*adamsızınız" deyənə cavab)*

*Bəli, varım çoxdu, min il də bəsdi,*
*İnci, mərcan, yaqut, ləlim var mənim.*
*Divani-təcnisdi dilim, cinasdı,*
*Hər fəsildə açan gülüm var mənim.*

*Oylağı talalı, oymağı bəlli,*
*Laləli, nərgizli, yasəmən telli.*
*Qaynar şəlaləli, çəmənli, çöllü,*
*Yaşılbaş sonalı gölüm var mənim.*

*Atam Dəli Kürdü, anam Arazdı,*
*Tarix ünvanımı daşlara yazdı.*
*Çoxum ayrı düşüb, azım çox azdı,*
*Könüldən-könülə yolum var mənim.*

*Göy inildər, tufan qopar, dağ uçar,*
*Hicran bitər, iki həsrət qovuşar.*
*Mətin xalqım bu bəladan sovuşar,*
*Dağları titrədən selim var mənim.*

*Kamandaram, dedim gün gələcəkdi,*
*Haqsızlıq həyatdan silinəcəkdi,*
*Böhtan dağılacaq, şər öləcəkdi,*
*Zülfüqar endirən əlim var mənim.*



### *QALACAQ*

*Həyat özü bir məktəbdi qanana,*
*Aqillərin yadigarı qalacaq.*
*Kim uysa böhtana, şərə, yalana,*
*Ömrü boyu əlil varı qalacaq.*

*Təbiət asacaq qəlbi xaini,*
*Oxun atıb, gizlətsə də yayını.*
*Hər kəs də alacaq əcr payını,*
*Nəticədə ahu-zarı qalacaq.*

*Vəzifə "kamillik" sevir dünyada,*
*Bu cütlük bir yerdə vəhdət yarada.*
*Şəxsiyyət, mərifət olsa arada,*
*Hörmətdən yapdığı barı qalacaq.*

*Nadanı görəndə soruş, çərçi, sən:*
*Firudinsən, ya Cəmşidsən, nəçisən?*
*Onlar aparmadı bircə zərrədən,*
*Dünyanın sənəmi varı qalacaq?*

*Xəzinə, dəfinə doludur ancaq,*
*Torpaq verib, torpağın da olacaq.*
*Fani dünya boşalacaq, dolacaq,*
*Dəyişməyən öz qərarı qalacaq.*

*Bəxtiyar o kəsdir, deyir Kamandar,*
*Onun hər mahalda ürək dostu var.*
*Pis olmaz bir qədər olsa dövlət-var,*
*İnsanlara xoş güzarı qalacaq.*



# Təbrik edirik!
# PROFESSOR QƏZƏNFƏR PAŞAYEV - 75



*Hörmətli Qəzənfər müəllim!*

*Sizi anadan olmağınızın 75 illik yubileyi münasibəti ilə təbrik edirik.*

*Azərbaycan elmi ictimaiyyəti Sizi tanınmış folklorşünas və ədəbiyyatşünas alim, dilçi, publisist və tərcüməçi olmaqla yanaşı, həm də aşıq sənətinin bilicisi və yorulmaz təbliğatçısı kimi tanıyır. Siz həm də Azərbaycan aşıqlarının 2008-ci ildə keçirilmiş V Qurultayından sonra AAB-nin İdarə Heyətinin və "Ozan dünyası" jurnalının redaksiya heyətinin üzvü kimi də səmərəli və məhsuldar fəaliyyət göstərirsiniz. Birliyin İdarə Heyətinin ən fəal üzvlərindən birisiniz və elə bir tədbirimiz olmayıb ki, orada fəal iştirak etməyəsiniz.*

*Elmi fəaliyyətinizdə aşıq sənətinə dair tədqiqatlar mühüm yer tutur və böyük iftixarla qeyd etmək istəyirik ki, bu sahədə bir sıra sanballı əsərlər sizin adınızla bağlıdır. Son illərdə bir çox tanınmış ustad aşıqlarımızın irsinin toplanaraq kitab halında nəşr olunmasındakı gərgin zəhmətiniz isə xüsusilə qeyd olunmalıdır.*

*Hörmətli Qəzənfər müəllim! Sizi 75 illik yubileyiniz münasibəti ilə Azərbaycan Aşıqlar Birliyi və şəxsən öz adımdan bir daha təbrik edir, Sizə uzun ömür, möhkəm cansağlığı və yorulmaz elmi və ictimai fəaliyyətinizdə yeni-yeni uğurlar arzulayıram!*

**Zəlimxan YAQUB,**
**Xalq şairi,**
**Azərbaycan Aşıqlar Birliyinin sədri.**

## Hörmətli Qəzənfər müəllim!

Sizi – tanınmış folklorşünas və ədəbiyyatşünas alim, dilçi, publisist və tərcüməçini 75 yaşınızın tamam olması münasibətilə təbrik edirik.

Siz 1962-ci ildə Azərbaycan Dillər İnstitutunun ingilis-Azərbaycan dilləri fakültəsini bitirmisiniz. Əmək fəaliyyətinə Əli Bayramlı (indiki Şirvan) rayonunun Vladimirovka kəndində ingilis dili müəllimi kimi başlamış, sonra isə İraqda ingilis və rus dilləri üzrə tərcüməçi işləmisiniz.

1964–1989-cu illərdə Azərbaycan Pedaqoji Dillər İnstitutunda (1973-cü ildən M.F.Axundov adına APİ) fəaliyyət göstərmiş, institutun ingilis dili fakültəsində dosent, dekan müavini (1970–1971), xarici dillər kafedrasının müdiri (1972–1989) olmusunuz. 1989–1999-cu illərdə ADU-nun Qərbi Avropa dilləri kafedrasında çalışmısınız.

Azərbaycan Milli Elmlər Akademiyası Nizami adına Azərbaycan Ədəbiyyatı Muzeyində Beynəlxalq əlaqələr şöbəsinin müdiri olmuş (2001–2005), eyni zamanda 2003-cü ildən Nizami adına Ədəbiyyat İnstitutunda baş elmi işçisiniz.

«Rusca-ərəbcə danışıq kitabı», «İngiltərə haqqında» (ingiliscə ölkəşünaslıq fənni üzrə dərs vəsaiti), «Altı il Dəclə-Fərat sahillərində», «İraq–türkman folkloru» (monoqrafiya), «Kərkük dialektinin fonetikası» (monoqrafiya), «İraq–türkman folklorunun janrlar sistemi» (rusca monoqrafiya), «Kərkük folklorunun janrları» (monoqrafiya), «İraq–türkman ləhcəsi» (monoqrafiya, ortaq), «Nostradamusun möcüzəli aləmi», «Nəsimi haqqında araşdırmalar» (monoqrafiya), «Nəsimi haqqında araşdırmalar», «Ədəbiyyatşünaslıq elmimizin patriarxı», «Borcumuzdur bu ehtiram», «Dilimiz – varlığımız» kitablarının müəllifisiniz.

Sizin tərtibatınızda «Kərkük bayatıları», «Arzu-Qəmbər dastanı», «Kərkük mahnıları», «İraq–Kərkük atalar sözləri», «İraq–Kərkük bayatıları», «Kərkük tapmacaları», «Nəsiminin İraq Divanı», «Kərkük folkloru antologiyası», «Göylər unutmuşdu yağacağını» (Ə.Bəndəroğlunun şeirləri və poemaları), «Azərbaycan folkloru antologiyası», «İraq-türkman cildi» (Ə.Bəndəroğlu ilə birgə), «Çağdaş İraq şeirindən seçmələr» (ortaqlı), «Yolun sonunadək» (Ə.Bəndəroğlunun şeirlər toplusu), «Hüseyn Arif – 80», «İsi Məlikzadə – 70», «Tofiq Bayram – 70», «Əlibala Hacızadə – 70», «Fikrət Qoca – 70», «Bəkir Nəbiyev – 75», «Ağlayan çox, gülən hanı?» (2007, Kərkük. Rəsul Rzanın şeirlər toplusu), «Mahmud və Məryəm» (2007, Kərkük), «Qoca Azaflıyam» (Azaflı Mikayılın şeirlər toplusu) kimi nəşrlər işıq üzü görmüşdür.

Rəsmi nümayəndə heyəti tərkibində Füzulinin anadan olmasının 500 illik yubileyi münasibətilə İraqda və Türkiyədə, Azərbaycan mədəniyyəti günlərində Səudiyyə Ərəbistanda və İ.Nəsimi ilə bağlı Beynəlxalq konfransda Suriyada olmusunuz.

İctimai işlərdə fəal iştirak etmisiniz: Ali Təhsil Nazirliyinin nəzdində Qərbi Avropa dilləri üzrə Elmi-Metodik şuranın elmi katibi (1976–1982), Azərbaycan–İraq Dostluq cəmiyyətinin sədr müavini olmuş (1990–2003), 1995-ci ildən Nizami adına Ədəbiyyat İnstitutu nəzdində fəaliyyət göstərən Müdafiə Şurasının üzvüsünüz. 1997–2006-cı illər arası və 2011-ci ildən yenidən həmin şuranın həmsədrisiniz. Qafqaz Müsəlmanları İdarəsinin nəzdində fəaliyyət göstərən Elmi-Dini Şuranın yarandığı 1997-ci ildən bu günə kimi oranın üzvüsünüz. 2004-cü ildən Yazıçılar Birliyinin Təftiş Komissiyasının sədrisiniz. Folklor üzrə Respublika Əlaqələndirmə Şurasının sədrisiniz.

Bir çox xarici ölkələrdə: ABŞ (iyun–avqust, 1983) və İngiltərədə (iyun–iyul, 1988) ixtisasartırma kurslarında olmusunuz. İraq Respublikasında tərcüməçi işləmiş (1962–1966; 1972–1975), Türkiyə, Səudiyyə Ərəbistanı, Suriya və keçmiş Sovetlər Birliyi ölkələrindən Rusiya Federasiyasında, Özbəkistan və Qazaxıstanda elmi konfranslarda məruzə etmisiniz.

SSRİ Nazirlər Sovetinin, SSRİ Təhsil Nazirliyinin, Azərbaycan Təhsil Nazirliyinin Fəxri fərmanları ilə təltif olunmusunuz. Eləcə də Kərkük Vəqfinin (1999) və İraq–türkman cəbhəsinin (2003), İraq Yazıçılar Birliyinin (2012) yüksək diplom və ödüllərinə layiq görülmüsünüz.

Bir çox doktorluq və namizədlik dissertasiyaları üzrə opponent, eləcə də kitabların redaktoru olmusunuz. Aspirantlara rəhbərlik etmisiniz. ABŞ, Türkiyə və İraqda ingilis, türk və ərəb dillərində məqalələriniz dərc edilib. «Ədəbiyyat qəzeti» və «Kredo» qəzetlərinin, «Folklor və etnoqrafiya», «Filologiya məsələləri», "Ozan dünyası" və «Kəlam» dərgilərinin redaksiya heyətinin üzvüsünüz.

Yaradıcılığınıza xaricdə və Azərbaycanda bir çox görkəmli alimlər, yazıçı, şair və publisistlər məqalələr həsr ediblər. Siz isə görkəmli Azərbaycan, türk, iraq, fransız, ingilis və amerikan yazıçı və şairlərinə, elm adamlarına çoxsaylı məqalələr həsr etmisiniz. Maraq doğuran cəhət bir də ondan ibarətdir ki, bu məqalələr Azərbaycan, türk, ingilis, ərəb, rus dillərində Azərbaycan, Türkiyə, İraq və ABŞ-da çap olunmuşdur.

Tərcüməçi kimi də fəaliyyətiniz diqqətəlayiqdir. A.Dümanın «Qafqaz səfəri», S.Benetin «Necə yaşayasan – yüzü haqlayasan», A.Kristinin «Mavi qatarın sirri», prof. İrəc Parsinecadın «M.F.Axunzadənin ədəbi tənqidi» kitabları sizin tərcümənizdə Azərbaycan oxucusuna çatdırılmışdır.

Hörmətli Qəzənfər müəllim!

Sizi bir daha yubileyiniz münasibətilə təbrik edir, sizə uzun ömür, cansağlığı, yaradıcılıq uğurları arzulayırıq.

**AZƏRBAYCAN YAZIÇILAR BİRLİYİ**

*(«Ədəbiyyat qəzeti», 1 sentyabr 2012-ci il.)*

***75 illik yubileyi ərəfəsində Professor Qəzənfər Paşayevin yaradıcılığına həsr olunan "Ömrün əbədiləşən illəri" adlı kitab nəşrə hazırlanıb. Kitabın redaktoru və ön sözün müəllifi Xalq şairi, Millət vəkili Sabir Rüstəmxanlıdır. Görkəmli elm və sənət adamlarının Qəzənfər müəllimlə bağlı həmin kitabda yer almış fikirlərindən seçmələri "Ozan dünyası"nın oxucularına təqdim edirik.***

***"Ozan dünyası"***

Hörmətli Qəzənfər, "Kərkük folkloru antologiyası" kitabını oxudum. Ağır zəhmət bahasına topladığın və ön sözdə izahını verdiyin bu incilərlə sən ədəbiyyatşünaslığımıza böyük xidmət göstərmisən. Bu inciləri oxuduqca xalqımla kərküklülər arasında çox incə bağlar və tellər gördüm, xalqımın mənəvi böyüklüyünün şahidi oldum.

Qəzənfər müəllim, sən İraqda 6 il rəsmi bir vəzifədə işləyərkən, bu sahədə öz vəzifə borcunu yerinə yetirməklə də kifayətlənə bilərdin. Lakin içində qımıldanan vətəndaşlıq hissi səni daha başqa bir borca səslədi. Bu səs damarlarından axan qan yaddaşının səsi idi. Sənin damarlarında dillənən səs, kərküklü qardaşlarının əsrlərdən bəri qanlarında qoruyub saxladıqları əcdadın – kökün səsi ilə həmahəng səsləndi və səni mənəvi borcunu ödəməyə çağırdı. Sən bu mənəvi vəzifəni şərəflə yerinə yetirdin. Rəsmi vəzifə borcun sənin İraqda olduğun müddətin çərçivəsində qaldı. İçində qımıldanan səsin əmri ilə yerinə yetirdiyin mənəvi vəzifə isə heç bir müddətə sığmır, müddətin çərçivəsini dağıdıb tarixə qovuşur. Çünki sən bu vəzifəni yerinə yetirməklə özünə deyil, bir-birindən ayrılmış böyük bir xalqa xidmət etdin. Şəxsi borc və ictimai borc burada haçalanır. Şəxsi borcu ödəməklə insan özünə, ictimai borcu ödəməklə isə xalqa xidmət etmiş olur.

**Bəxtiyar Vahabzadə**
Xalq şairi, akademik.

Bizim üçün İraq Füzulidən, Füzuli Kərbaladan başladığı kimi, Kərkük də Qəzənfər Paşayevdən başlayır.

**Yaşar Qarayev**
AMEA-nın müxbir üzvü.

Altı illik səmərəli zəhmətin əbədiləşən səhifələrini nəzərdən keçirdikcə Q.Paşayevin şəxsində istedadlı dilçi, ədəbiyyatşünas, tarixçi, etno-

qraf alimlə, sosioloq və jurnalistlə, ən ümdəsi də bütün bunları özündə cəmləşdirən, görüb-götürmüş şərqşünas bir mühasiblə üz-üzə dayanırıq.

**Qasım Qasımzadə**
professor, şair-alim.

İraq türkmanlarını, onların çox zəngin mənəviyyat xəzinəsini öz əsərləri ilə Azərbaycan üçün, müəyyən mənada, bəlkə də bütün türk elləri üçün, məhz Qəzənfər müəllim kəşf etmişdir... O, böyük vətənpərvər ziyalıdır.

Tarixən Azərbaycanda üç ziyalı tipi olub: ənənəvi şərq ziyalı tipi, rus-qərb ziyalı tipi və hər ikisinin uğurlu sintezindən ibarət olan yeni Azərbaycan ziyalı tipi. Professor Qəzənfər Paşayev Şərq və Qərb ziyalı tipinin ən yaxşı keyfiyyətlərini özündə birləşdirən dəyərli ziyalılarımızdandır.

**Bəkir Nəbiyev**
Akademik

İstedadı və gərgin əməyi sayəsində Qəzənfər Paşayev bu gün Azərbaycanda İraq türkman dili və ədəbiyyatının, türkman folklorunun ən gözəl bilicisi, beynəlxalq aləmdə isə bu sahənin ən görkəmli mütəxəssislərindən biri hesab edilir. Qəzənfər Paşayev İraq türkman dili, ədəbiyyatı və folkloruna dair bir sıra fundamental əsərlərin müəllifi və tərtibçisidir...

Cəsarətlə deyə bilərik ki, Qəzənfər Paşayev "Altı il Dəclə-Fərat sahillərində" kitabından başqa bir şey yazmasaydı belə, təkcə bu əsər onun bir ədib kimi şöhrət qazanması üçün kifayət idi. Kitabı Azərbaycan dilində olduğu kimi, ərəb dilində də ürəksiz, həyəcansız oxumaq mümkün deyildir.

**Vasim Məmmədəliyev**
Akademik

Həqiqətən, bu gün azərbaycanşünaslıqda kərkükşünaslıq adlı müstəqil bir elm sahəsi var. Bu elm sahəsi Kərkük-türkman elinin, dilinin, folklorunun, tarixinin bir sintez şəklində təqdimidir. Onun qurucusu prof. Qəzənfər Paşayevdir... Prof. Q.Paşayevin monoqrafiyaları və tərtib etdiyi kitabların sayı 40-dan artıqdır. Düşünmək olardı ki, o, folklorşünas, ədəbiyyatşünas, tərcüməçi, publisist kimi xalq arasında yaxşı tanındığına, bu sahədə nüfuz sahibi olduğuna görə bir daha dilçilik aləminə qayıtmaz.

Lakin belə deyilmiş. “Dilimiz – varlığımız” kitabını (Bakı, 2011) oxuduqca gözlərimiz önündə qədirşünas bir dilçi alim canlanır.

**Tofiq Hacıyev**
AMEA-nın müxbir üzvü

Tanınmış elm və maarif xadimi, f.e.d., professor Qəzənfər Paşayev İraqlı soydaşlarımız olan kərküklülərin folkloru, dili və ədəbiyyatı haqqında yazdığı dəyərli əsərləri ilə Turan elində böyük ad-san qazanmışdır.

**Ağamusa Axundov**
Akademik

İraq türkmanları ilə bağlı dərin və sanballı tədqiqatları Qəzənfər Paşayev aparmışdır. Paşayev bizim o ziyalılarımızdan, o böyük alimlərimizdəndir ki, yalnız bir sahə üzrə işləməyib. Biz onu gözəl dilçi, folklorşünas, etnoqraf, tərcüməçi və s. kimi tanıyırıq. Q.Paşayev bizim alimlərimiz içərisində, bəlkə də ən çox iş görən və ən təvazökar tədqiqatçılardandır. O, böyük bir institutun görə bilməyəcəyi işi görmüşdür. Bu da onun bizim bugünkü ədəbi-ictimai həyatımızda mövqeyini xüsusilə möhkəmləndirir. Bu qədər böyük işləri başqa birisi görmüş olsaydı, yəqin onun ədası yerə-göyə sığmazdı.

**Nizami Cəfərov**
AMEA-nın müxbir üzvü,
Millət vəkili.

Professor Sula Benetin çox maraqlı “Necə yaşayasan – yüzü haqlayasan” əsərini ingilis dilindən Azərbaycan dilinə Qəzənfər Paşayev yüksək peşəkarlıqla tərcümə etmişdir. Əsər azərbaycanlı oxuculara layiqli töhfədir. Əlçatmaz, ünyetməz uzaq Amerikanın bu töhfəsini bizə yaxın edən, doğma edən Qəzənfər Paşayevə minnətdarıq.

**Teymur Bünyadov**
Akademik

Bir zamanlar tək, vahid torpaq halında olan Kərkük və Azərbaycan indi iki ayrı ada halına gəlmişdir. Bu gün bu iki adanı bir-birinə bağlayan körpünün memarı məhz Qəzənfər Paşayevdir... İftixarla söyləyə bilərik ki, artıq o, Əta Tərzibaşı qədər dəyərli bir araşdırıcımızdır.

Prof. **D.Mahir Naqib**

Qəzənfər Paşayevin "İraq türkman folkloru" kitabına bənzər bir kitab indiyə qədər nə İraq türkmanları, nə də İraq türkmanlarının folkloru ilə məşğul olan xarici alim və tədqiqatçılar tərəfindən yazılmışdır... Ağlasığmayan yorğunluqların məhsulu olan bu misilsiz əsəri İraq türkmanları arasında folklor çərçivəsində bir şah əsər kimi qiymətləndirmək daha doğrudur. Bu günə qədər bizdə – İraq türkmanlarında, Türkiyədə və Azərbaycanda folklorumuzun bu biçimdə tədqiqi, incələnməsi və araşdırılması olmamışdır.

Dr. **Əbdüllətif Bəndəroğlu**

Qəzənfər Paşayevin "İraq türkman folkloru" kitabı bilimsəl və orijinal bir şəkildə Kərkük və Azərbaycan folklorunun müştərəkliyini ortaya qoyan müstəsna və nadir bir çalışmadır.

**İzzəttin Kərkük**
Kərkük vəqfinin təsisçisi və başqanı.

Qəzənfər Paşayevin yaratdığı "İraq türkman ocağı"nı ilk ziyarət edən adamlardan olduğumdan çox məmnun oldum. Əminəm ki, bu ocağın istisinə və işığına türk xalqlarının mədəniyyətinin bir çox nümayəndələri yığışacaqlar. Uğurlar olsun. Ən xoş arzularla.

**Fatma Abdullayeva**
professor.
04.04.1995

Professor Qəzənfər Paşayev "İraq türkman ocağı"nın həm maddi, həm də mənəvi memarıdır. Hər şey onun əsəri sayılır. Tabloların, rəsmlərin, bəzənmiş salonların təmir işlərinin xərcini özü çəkmişdir. Muzeyi əhatə edən kitabları alim İraq və Türkiyədən gətirmişdir... Türkman folkloru mütəxəssisi professor Q.Paşayevin hazırladığı proqram son dərəcə dinamik və təsiredici idi. İhsan Doğramacı söz və nəğmələrlə bəzənmiş səhnələr qarşısında dərin bir səssizliyə dalmışdı və xatirələrin həzin səsləri altında ruhunu dinləyirdi... Bu hisslər Doğramacını illərin, ayların

dolaylarına götürmüşdü... Müğənnilərin oxuduğu Kərkük mahnılarının qucağında yer-göy Kərkük, Ərbil olmuşdu.

Prof. Dr. **Cəlal Ərtuq**

Professor Qəzənfər Paşayev, əslində, azərbaycanlılara Kərkük dünyası üçün bir pəncərə açdı və Bakıda İraq türkmanlarının bir elçisi oldu.

Prof. Dr. **Suphi Saatçı**

Gözəl niyyətlə yazılan və gerçəyi olduğu kimi ortaya qoyan çox qiymətli "Altı il Dəclə-Fərat sahillərində" kitabı İraq-Azərbaycan dostluğunun tarixinə, çağlar boyuna işıq tutacaq və bu iki ölkə arasındakı ədəbi əlaqələrin də sürətli bir biçimdə inkişafına kömək göstərəcəkdir. Kitabı ərəb dilinə tərcümə edərək Bağdadda çap etdirməyimiz, hər şeydən əvvəl bununla bağlıdır.

Dr. **Əbdüllətif Bəndəroğlu**

İraq türkmanlarının folklorunu azərbaycanlı qardaşlarımıza tanıtmaq üçün bir çox araşdırmalar yapan Q.Paşayevin əsərləri Oğuz kökündən və soyundan olan Azərbaycan türkləriylə İraq türklərinin dil və folklor baxımından nə qədər bir-birlərinə bağlı olduqlarını açıqca göstərməkdədir.

Prof. Dr. **Mustafa Arqunşah**
Kayseri Universiteti, Türkiyə.

Elə bu yerdə mən bizim görkəmli ədəbiyyatşünas alimimiz Qəzənfər Paşayevin böyük və şübhəsiz ki, gərgin zəhmətinin bəhrəsi kimi azərbaycanlı oxuculara təqdim etdiyi fundamental yaradıcılıq işini – Mişel Nostradamusun bütün Senturiyalarının dilimizə tərcüməsini və geniş izahını xüsusi qeyd etmək istəyirəm və bunu yalnız tərcümə ədəbiyyatımızın deyil, ümumiyyətlə, ictimai fikrimizin inkişafında hadisə hesab edirəm.

**Elçin**
Xalq yazıçısı

Qəzənfər Paşayevi ilk dəfə «Kərkük bayatıları» ilə tanıdım. Onu tanımağım həm də böyük bir millətin ayrı düşmüş parçasını tanımağım idi. «Kərkük bayatıları» ilə İraq türkmanları kəşf olunmuşdur. Bəlkə də

bu kitab olmasaydı mən 1969-cu ildə radioda «Bulaq» verilişini yaratmazdım. O zaman məndən bir addım qabaqda olan bir neçə sağlam düşüncəli adama sığınmışdım. Qəzənfər Paşayev də bu düşüncəni yaşadan ziyalılardandır.

**Mövlud Süleymanlı**
Xalq yazıçısı

«Bilmirəm haralıyam, torpağım, daşım qərib», – deyən kərküklülərin bayatılarından, xalq mahnılarından, atalar sözlərindən, tapmacalarından ibarət nəfis nəşrlər (biz hələ «Altı il Dəclə-Fərat sahillərində» adlı məşhur kitabı demirik) son illərdə oxucularımızın kitab rəflərini bəzəməkdədir. Bütün bunlar uzun illərdən bəri kərküklülər içərisində işləyən Qəzənfər Paşayevin Kərkük folklorunu toplamaq sahəsində gördüyü gərgin işinin, fədakar yaradıcı əməyinin nəticəsidir.

**Azad Nəbiyev**
AMEA-nın müxbir üzvü

«Altı il Dəclə-Fərat sahillərində» azərbaycanlı alim, professor Qəzənfər Paşayevin nəinki ölkəmizə məhəbbətini, hətta müəllifin İraqın mədəni, tarixi və siyasi əhəmiyyətini dərk etdiyini nümayiş etdirir. Bu kitabın vətənimizin tarixi ilə ilk dəfə tanış olan əcnəbi oxucular üçün yazılmasına baxmayaraq, müəllifin İraqın ictimai-ədəbi həyatına ekskursiyalarının təfsilatları kitabı iraqlı oxucular üçün xüsusi bir rayihə ilə süsləndirir… Kitab bizi oba-oba gəzdirir, İraqın elm və mədəniyyət mərkəzləri ilə tanış edir. Əsər iraqlı oxucuda bu ölkəyə mənsub olması fəxr hissi və kitabın hörmətli müəllifinə və mütərcim dostumuz şair Əbdüllətif Bəndəroğluna dərin minnətdarlıq hissləri oyadır.

**Əbdülhəmid Həmudi**
«Əs-Janra» (İnqilab)qəzeti, Bağdad
07.06.1996

Azərbaycanda humanitar fikir aləmində Q.Paşayevi tanımayan, hətta deyərdim, sevməyən adam tapılmaz. Çünki o qədər işıqlı adamdır ki, inanmıram, bu işığın nuruna kimsə paxıllıq eləyə… O, görkəmli alimdir.

Hansını deyim? O, dilçidi, folklorşünasdı, ədəbiyyatşünasdı, tərcüməçidi, publisistdi…

**Vaqif Yusifli**
filologiya elmləri doktoru

Professor Q.Paşayevin elmi-ədəbi fəaliyyəti ən müxtəlif istiqamətlərdə ayrıca tədqiqat mövzusu, araşdırma obyekti olmağa layiqdir. Görkəmli alimin folklorşünaslıq, ədəbiyyatşünaslıq, tərcüməçilik fəaliyyətinin hər biri geniş bir tədqiqat mövzusudur. Lap elə İraq türkmanlarının dili, folkloru və ədəbiyyat sahəsindəki çalışmalarının özündən ayrıca bir dissertasiya işinin yazılması ancaq və ancaq qədirşünaslıq kimi dəyərləndirilə bilər.

**Məhərrəm Qasımlı**
professor

Q.Paşayev İraq türkmanlarının həyat və məişətini ağız ədəbiyyatı ilə birlikdə araşdıra-araşdıra, bu yöndə kitablar yaza-yaza bizi də Kərkük sevdasına mübtəla etdi. Böyük sevda şairi M.Füzulini yetirən el-oba Q.Paşayevin Kərküknaməsindən sonra bizim üçün Şəki, Şirvan, Qarabağ, Naxçıvan kimi əlçatan, ünyetən el-oba oldu.

**Muxtar İmanov**
filologiya elmləri doktoru

Xatirəni yaratmaq da, yaşatmaq da çətindir. Dəqiq desək, xatirəni yaratmaq üçün də, yaşatmaq üçün də şəxsiyyət olmaq lazımdır. Professor Qəzənfər Paşayev ədəbi-ictimai mühitdə sayılıb-seçilən, nüfuzu və yeri olan, həm müasirlərinə, həm də dünyasını dəyişmiş unudulmazlara yüksək qədirşünaslıq bildirən belə şəxsiyyətlərdən biridir… Onun «Borcumuzdur bu ehtiram» kitabına başda Ulu Öndər Heydər Əliyev olmaqla iyirmi beş ziyalı – dövlət xadimi, alim, müəllim, yazıçı və şair haqqında portret oçerklər toplanıb. Kitaba daxil olan bütün oçerklər böyük səmimiyyətlə yazılıb, hər biri şirin layla kimi, nurlu elegiya kimi oxunur… Müxtəlif illərdə qələmə alınan bu yazıların hamısını qəmli bir «…ölümündən sonra» fəryadı birləşdirir.

**Nizaməddin Şəmsizadə**
**professor**

*Xalq şairinin arxivindən*



**Xəlil Rza ULUTÜRK**
**Xalq şairi**

# BAKIDA SAZ BAYRAMI[1]

Bakıda saz bayramı, Filarmoniyada Borçalı aşıqlarının çıxışı. Gözlərdə sevinc işığı. Səhnədə boz kostyumlu, ağ köynəkli, qəhrəman ruhlu, şair Zəlimxan və onun ürəklərə hakim kəsilən coşqun, mərd səsi. Zəlimxan özünə yaraşan natiq səsilə aşıqları bizə təqdim edir. "Mənim" rədifli gözəl bir şeirini deyir. Yalnız bəzi misraları yadda saxlaya bilirəm:

*Əl açıb göylərə çox yalvarmışam,*
*Qoy bu gün saz olsun Allahım mənim.*

*...Əzrayıl dayana qəsdimə bir gün,*
*"Cəngi"dir, "Misri"dir pənahım mənim.*

[1] Xəlil Rza Ulutürkün arxivində qorunub saxlanılan bu yazı Borçalı aşıqlarının 1982-ci il sentyabrın 28-də Bakıda Filarmoniyada keçirilmiş konserti barədə Xalq şairinin təəssüratlarıdır. İlk dəfə çap olunur.



Qoşmanın sonu "Hüseynim, Kamandarım, Əmrahım mənim" misrası ilə bitir. Qafiyə tələbi Əmrahı sonuncu yerə gətirib. Əslində onun yeri ən azı Hüseyn Saraclı ilə Kamandarın arasında olmalıdır. Üç aşıq, üç böyük sənətkar bu axşam diqqət mərkəzindədir. Zəlimxan Çıldırlı Aşıq Şenlikdən, zəhərli quyuya salınmış Aşıq Abbasdan tutmuş bu gün səsi qurultaylardan gələn sənətkarlaradək aşıq poeziyasının həyat yolunu işıqlandırır. Borçalı Aşıq məktəbinin Nəbi, Ağacan, Hüseyn Saraclı, Əmrah və Kamandar kimi ulu sənətkarlara borclu olduğunu yada salır.

– Bu diyarda Aşıq Əmrah məktəbi yaranıb, – deyir, – Bu məktəb müqəddəsdir.

*Xallar, güllər bir-birindən öyməli,*
*Telli sazı çalana bax, çalana!*
*Dirsək dizdə, əl çənədə qalıbdı,*
*Məni məndən alana bax, alana!*

Heyif ki, Zəlimxanın ağzından saçdığı mirvariləri yığıb-yığışdırmaq olmur:

*Ay Zəlimxan, külə dönsəm odunda,*
*Deməsinlər yalana bax, yalana.*

Natiq şairimizin sonrakı şeirindən yalnız bircə misranı yadda saxlaya bilirəm: "Sənə Haqdan gəlib saz, Əmrah dayı!"



Zəlimxanın nəsr şəklində dediklərini də şeirə döndərib yadda saxlamağa çalışıram:

*Hüseyn Saraclının gümüş sazından,*
*"Şərili", "Ovşarı" ölməzlik aldı.*

Natiq şairimiz Koroğlunu xatırlayır. "Usta, qulun ollam, al, düzəlt sazı" misrası ilə süslənmiş Koroğlu şeirinə ayrıca məna verir. Sonra Osman Sarıvəlli misralarını salona güldəstə kimi paylayır:

*Saz oyun deyildir düşündüyüntək,*
*Onda "Kərəmi" var, onda "Cəngi" var,*
*Hər teldə bir əsrin öz ahəngi var.*
*Hər fikir mülkündə zərrin tac yatır,*
*Hər meyvə tumunda bir ağac yatır,*
*Hər kiçik bayatı xalqın səsidir,*
*Kamal dünyasının xəzinəsidir.*

Hiss olunur ki, Zəlimxan bu məclisdə söz deməyə gözəl hazırlaşıb. Yanımda əyləşmiş elmlər doktoru, filosof qardaşımız Camal Mustafa deyir ki, bu şairi göydən zənbillə salıblar Borçalıya. Zəlimxan anadangəlmə şairdir.

Dürüst sözə nə deyəsən?

*Yenə, a Saraçlı, nə yandırırsan,*
*Üzünə gülməyən zamanınmı var?*

Zəlimxanın təsvirində tünd qara bığlı, mavi geyimli qocaman aşıq Hüseyn Saraclı gözümüzdə bir az da yüksəlir. Yetim dürrə bənzər bir misranı unutmamağa çalışıram: "Ölünü dirildən aşığa alqış!".

Zəlimxam:

– Müqəddəs Kamandarımız bu məclisdədir! – deyir.

Zalda alqış tufanı. Natiq onu ağır oturub batman gələn, ürəklərdə yer tutan, qeyri-adi, ülvi sənətkar adlandırır, ona həsr etdiyi qoşmanı böyük ilhamla əzbər deyir:

*Ağrını, azarı qoyma yaxına,*
*Durma, usta tərpən, usta, Kamandar!*
*Beş gün ömrüm olsa, bölərəm yarı,*
*Verrəm sənin kimi dosta, Kamandar!*



Ağ köynəkli, boz kostyumlu Zəlimxan təvazökarlıq, mərdlik və gənclik timsalıdır.

Müsamirə 83 yaşlı, sallama qayışlı, qolu saatlı, mixəyi papaqlı Aşıq Əmrahın möcüzə çıxışı ilə başlanır. "Qaraçı" el havasını sazda elə incə, o qədər ustalıqla çalır ki, tellər bülbül kimi oxuyur. Yanımda əyləşmiş elmlər doktoru, filosof qardaşımız Camal Mustafa deyir ki, bu, əslində el havası deyil, Qaraca oğlanın yaratdığı musiqidir.

Aşıq Məhəmməd və Aşıq Aslan unudulmaz Səməd Vurğun ilə Aşıq Şəmşirin deyişməsini "Şərili" havası üstə məclisə yetirirlər.
Aslan Səməd Vurğun rolunda:

*Aşıq Şəmşir, Dəlidağdan keçəndə,*
*Kəklikli daşlardan xəbər al məni.*
*Ceyran bulağından qızlar içəndə,*
*Saz tutub, söz qoşub yada sal məni.*

Aşıq Şəmşir rolunda çıxış edən Aşıq Məhəmmədin kəlamından bir misranı unutmamağa çalışıram: “Bilirik şeirdə bir mayak səni”.

“Dastanı” havası üstə çalıb-çağıran Aşıq Əhməd və Aşıq Nadir Molla oğlu gənc və qüdrətlidirlər: “Ayna bulaqları içdi, doymadı. Qaldı ceyranlarda gözü Vurğunun”.

Aşıq Sadıq və Aşıq Ziyəddin “Qəhrəmanı” havası üstə çalıb-çağırırlar. Osman Sarıvəllinin sözləri nəfəslərə od gətirir:

*Əziz sirdaş kimi, yaxın dost kimi,*
*Qolunu boynuma saldı bu yerlər.*
*Qoymadı qəlbimdə bir nisgilimi,*
*Oxşayıb qəlbimi aldı bu yerlər.*

Gödərək boylu gənc Ziyəddin gözdə yüksəlir, gur alqış qazanır.

– Afərin!

– İndi sözü Aşıq Hüseyn Saraclıya veririk.

Alqış tufanı. Qara bığlı, tünd mavi geyimli ustad qocalıb.

– Bağışlayın! – deyir, – soyuqlamışam, boğazım pozulub.

Ancaq elə çalıb-çağırır, elə məzəli danışır ki, dərhal ürəkləri ələ alır. Heyif, maqnitafon qaytanı deyiləm ki, onu sizə bütünlüklə çatdırım. Diləkləri müqəddəsdir:

*80 min oğlum, 80 min qızım,*
*80 min incəbel yarım olaydı.*
*80 min toyuğum yumurta üstə,*
*80 min ördəyim, qazım olaydı.*

Qafiyəni pozan mənim yaddaşımmı, yaxud sənətkar sərbəstliyi? Şeirin sonu gur alqış dalğası gətirir: “Gedəndə beş arşın bezim olaydı”.

Aşıq Hüseyn Saraçlı son dərəcə duzlu-məzəli sənətkardır. Arvadının təhriki ilə təknəni götürüb evdən çıxan və qalaylatmaq üçün qalayçıya üz tutan kişi haqqında söhbəti qırır salonu gülməkdən.

– Məgər təknəni də qalaylarlar?

– Başın qoltuq görsə, qalaylarsan!

“Mansırı” havası üstə Qəmkeşin sözlərini çalıb-çağırır:

*Şaha baş əyməyən nazlı afətin,*
*Məzarda qoynunda ilan yatıbdır.*

Heyif, bu gözəl şeiri tam yadda saxlaya bilmirəm. Ayrı-ayrı misralar qaranlıqda çaxan ildırım kimidir: “Ağadan yuxarı çoban yatıbdır”. Sonu didaktika saçır:

*Əgər varlı olsan, səxavətli ol,*
*Şöhrət yuvasında şeytan yatıbdır.*

Sürmeyi papaqlı, sallama kəmərli, uzunboğaz çəkməli, altun dişli, pəhləvan gövdəli, təmkinli, mətin sənətkar Aşıq Kamandar səhnəyə Aşıq Nurəddin ilə qoşa gəlir. Xəstə Qasımın sözlərini “Təcnis” havası üstə çalıb-çağırırlar:

*Ləli tapşırdılar nadana, gördüm,*
*Qədrini bilmədi, ay hayıf, hayıf!*

Musiqi o qədər gözəldir ki, mətni tam qavramağa macal tapmıram.

*Bağladım,*
*Arxı arxa bağladım.*
*Nə namərdə sirr verdim,*
*Nə də arxa bağladım.*

Dərhal hiss olunur ki, Aşıq Kamandarın aşıqlığı və ilhamı saz poeziyasının çox dərin qaynaqlarından süzülüb gəlir. Onu dinləyəndə hələ bu vaxtacan tam azərbaycanlı ola bilmədiyimi daha aydın dərk edirəm, vaysınıram. Məgər saz çala bilməyəni, bu boyda mədəniyyəti yalnız seyrçi kimi dinləyəni də azərbaycanlı adlandırmaq olar?

*Oxuyub dərsimi yetdim Yasinə,*
*İgid olan ümid bağlar ya sinə.*
*Xəstə Qasım ölüb gedər ya sinə,*
*Eşidənlər deyər: ay hayıf, hayıf!*

Melodi dəyişir və ürəyimizi, köksümüzü dağların havası, ətri ilə doldurur:

*Üstündən karvan yeriməz,*
*Sıxdı dumanların, dağlar.*
*Yayda, yazda heç əriməz,*
*Quzeylərdə qarın, dağlar!*

– Barmağa baxın, e!

Səhnə gülüstana dönür. Yanımda əyləşmiş elmlər doktoru, filosof qardaşımız Camal Mustafa deyir ki, “Dübeyti” havası bəzən Səməd Vurğunun şərəfinə “Dağlar” adlanır.

*Qayaların baxar, dinməz,*
*Laçınların göydən enməz.*
*Yaman gündə üzün dönməz,*
*Pozulmaz ilqarın, dağlar!*

Alqış tufanı Kamandarı səhnəyə qayıtmağa vadar edir. Nurəddin də onun ardınca gəlir. “Məhəmmədbağırı” havası çalınır. Sazının uzun qolu gümüşə tutulmuş Kamandar aşıb-daşan güllərə, el sevgisinə layiqliyini yenidən göstərir.

Fasilədən sonra Koroğlunun sözləri üstə “Misri” havasını çalan göy mahud kostyumlu, zil səsli Aşıq Nadiri dinləyirik. Sonra “Naxçıvanı” havası üstə Aşıq Aslan çalıb-çağırır.

Yanımda əyləşmiş çal saçlı, tunc sifətli, gülər üzlü filosof qardaşımız Camal Mustafa deyir ki, bu qızılgül bənizli aşıq mənim kəndçimdir.

Onun hansı kənddən, Borçalıdan hansı oymaqdan çıxdığını sormağa macalım yoxdur. Aşıq Əmrah Gülməmmədov həzrətlərini yenidən dinləyirik. Muğam çalır. Keçir Qarabağ şikəstəsinə. Çox incə çalır. Gur alqış dalğaları altında tunc sifətli, çal saçlı filosof qardaşımız Camal Mustafa deyir ki, fikir ver, tar sazın balasıdır. Əmrahı dinləyəndə bunu aydın başa düşmək olur.

Səhnəyə yenidən qayıdan aşıq: “İnsan əli boz tikanı istəsə, gülə döndərər” misraları ilə boy göstərir. Sözlər kimindir? Zəlimxanınmı?

Yanımda əyləşmiş filosof dostumuza demək istəyirəm ki, bu əziz gecə yaddan çıxmayacaq. Nə gənc Aşıq Sayad unudulacaq, nə onun “Orta Sarıtel” havası üstə oxuduğu Ələsgər sözləri. Nə Kamandar unudulacaq, nə onun oğlu gənc Aşıq Cavanşirin sədəfi yaşıla çalan, ağ şöləli sazı, nə tələbə dostlarının gətirdiyi saysız çiçək qomları. Göy mahud kostyumlu, qızıl dişli Aşıq Məhəmməd Sadaxlının məharətlə çaldığı “Məhəmməd-bağırı” havası daim qulağımıza pıçıldayacaq:

*Vəfalı dost unutmaz,*
*Görməsə yüz il məni.*

Kərəmin sözləri üstə “Kərəmköçdü” havası çalan Aşıq Ziyəddin də bu gününü yadda saxlayacaq, əyninə ağlı-qırmızılı güllər ilə bəzənmiş köynək geyib səhnəyə çıxan, saza gücü çatmayan, körpə barmaqları ilə tellərə can verən çocuq Vüqar Bəxtiyarov da.

Kamandarımız səhnəyə yenidən qayıdır.

– Heç kəsin yuxusu gəlməsin, – deyir, – çıxışlarımız təzədən başlanır.

Gülüş dalğası. Son söz yenə Zəlimxanındır. Söylədiyi şeirin yalnız ayrı-ayrı beytlərini yadda saxlamağa macal tapıram:

*Ya Qoşqar olasan, ya da Şahdağı,*
*Belə ucalasan ucalanda da.*
*Borandan, tufandan, qardan, yağışdan,*
*Belə bac alasan, bac alanda da.*

*Şöhrət gözlərini qamaşdırmaya,*
*Başında günəşdən tac olanda da.*
*Başa qar yağsa da, bel bükülməyə,*
*Belə qocalasan qocalanda da.*

Yox, bu sözlər Zəlimxanın olsa da, çalıb-çağıranı Kamandarımızdır.

Qızıl dişlər arasından qızıl sözlər qanadlanır. Səsi gur, avazı vüsətli, yaxası qoşa qızıl medallı sənətkara “Sağ ol!” deməkdən özünü saxlaya bilmirsən. Son zəngulələri, Məmməd Arazın məşhur bir şeirini salona güldəstə kimi tullayır:

*Bəlkə bu yerlərə bir də gəlmədim,*
*Duman, salamat qal, dağ, salamat qal.*
*... Arxamca boylanan, ay mələk, sən də*
*Boylan, salamat qal, bax, salamat qal!*

Səhnə arxasına keçir, alnı, üzü tərli aşıqları təbrik edir, öpüb qucuruq.

Filarmoniyadan filosof qardaşımız, tunc sifətli, gülərüzlü Camal Mustafa ilə birlikdə çıxır və Araz kinoteatrının tuşunadək qonuşuruq.

– Ən böyük poeziya daim şəffafdır, sadədir, – deyir, – şəffaflıq, sadəlik olmayan yerdə poeziya yoxdur. Buna görə mən qərbi yamsılayan, anlaşılmazlıq, hərc-mərclik törədən şeirbazlara inanmıram.

*Öyrənmək istəsən aşıq sirrini,*
*Axtar dayazları, dolaş dərini.*

Göygöl nə qədər durudur! Çünki dərindir. Bizim klassik aşıq poeziyası həm dərindir, həm duru. Eyni fikri Ələsgər də deyir, Puşkin də. Birinci ikincidən heç də geri qalmır:

*Ələsgərəm, hər elmdən halıyam,*
*Gözəl, sən dərdlisən, mən yaralıyam.*
*Dedi: nişanlıyam, özgə malıyam,*
*Sındı qol-qanadım, yanıma düşdü.*

Puşkin bu fikri Tatyananın dilindən daha yığcam deyir:

*Raz ya druqomu otdana,*
*Vek budu yemu verna.*

Əslində burada Tatyana rus qızından daha çox şərq qızı təsiri bağışlayır. Rus qızının təbiətində sərbəstlik daha güclüdür. O, sevmədiyinə sədaqətli ola bilməz. "Ələsgərəm, hər elmdən halıyam". Burada söhbət mərifət elmindən gedir. Mərifət elmi insanşünaslıq deməkdir.

Çal saçlı, tunc sifətli filosof qardaşımız Camal Mustafa idrak nuru saçır, söhbəti dolandırıb böyük filosof Sokratın üstünə gətirir. Onun haqqında Nizami Gəncəvinin bir misrasını yada salır: "Ölümün üstünə dördnala çapdı". Bu misra Sokrat cəsurluğuna işarədir. Sokrata edam kəsilir. Ancaq gəmilər dənizdə olduğu üçün edam bir ay yubandırılır. Bu fürsətdən istifadə etməyə çalışan dostları pul yığıb Sokratı satın almaq, ölümdən xilas etmək fikrinə düşürlər. Bundan xəbər tutan Sokrat qəhqəhə çəkib gülür:

– Məni pul gücünə satın almaq fikrinə düşübsünüz? Ha, ha, ha! Təqsir mənimdir. Görünür, sizə yaşamaq yolunu öyrətmişəm, ölməyi yox.

Hələ də gec deyil. Yığışın, gəlin, sizə yenidən dərs deyəcəm. Bu dəfə ölməyi bacarmağı öyrədəcəm.

Ona iman gətirənlərə Sokrat yenidən dərs deməyə başlayır. Edam günü gəlib çatır. Cəllad ona gec öldürən zəhər piyaləsi uzadır. Sokrat piyaləni alıb birnəfəsə içir. Öncə qıçları tutulur. Sonra bənizi ağarır, göyərir. Onun bu halına cəllad belə ağlayır. Özü isə təmkinini itirmir.

– Sizin gördüyünüz cismimdir, – deyir, – ruhum uzaqlarda qanad çalmaqda.

Camal müəllim – çal saçlı, tunc sifətli filosof qardaşımız məsləhət görür ki, bu iki kitabı mütləq oxuyum: 1. Platon, "Apoloqiya Sokrata", I cild. 2. "Fedon"/dialoq/.

**Məhərrəm QASIMLI**
**professor, Azərbaycan Respublikasının**
**Dövlət Mükafatı laureatı**



# DƏDƏ QORQUDDAN ÜZÜ BƏRİ

Sazın-sözün əzəli və əbədi missiyası xalqın dilini, ruhunu yaşatmaq, arıdıb durultmaq, onun tarixi-mənəvi kimliyini, etnoqrafik yaşam tərzini, folklor dəyərlərini, fikir-düşüncə özünəməxsusluğunu, könül gözəlliklərini sirli-sehrli bir ecazkarlıqla sabahlara daşımaqdır. Yüzillərin uzaq dərinliklərində möhtəşəm oğuznamələri düzüb-qoşan alp ozanların könül yadigarları bu gün bizim üçün ona görə əzizdən əzizdir ki, onların hər kəlməsində dilimizin, ruhumuzun, mənəvi varlığımızın aydınlığını, duruluğunu, yenilməzliyini görə bilirik. Bu baxımdan Ata Qamların (şamanların), Dədə Ozanların əski çağlardan başladıqları mübarək yolu – dil və ruh mücadiləsini sonrakı dönəmlərdə ustad aşıqlarımızın yüksək poetik ovqatla davam etdirməsi, mənsub olduğu xalqın mənəvi gücünü qürurla daşıması, yeni nəsillərə təlqin edib mənimsətməsi milli varlığımızın, o cümlədən də istiqlal və dövlətçilik düşüncəmizin qorunub möhkəmləndirilməsində mühüm rol oynamaqdadır.

Oğuz epoxasının ozanı oğuznamə söylədiyi zaman məhz dövlətçilik düşüncəsinə (və həm də qüruruna!) söykəndiyi üçün aşağıdakı poetik nidaları səsləndirirdi:

*Alar-sabah sapa yerdə dikiləndə ağ ban evli!*
*Atlasla yapılanda gög sayvanlı!*
*Tavla-tavla çəkiləndə şahbaz atlu!*
*Çağırıban dad verəndə yol çavuşlu!*
*Yayqandığında yağ dökülən bol nemətlü!*
*Qalmış yigit arxası!*
*Bizə miskin umudu!*
*Bayındır xanın göygüsü!*
*Tülü quşun yavrusu!*
*Türküstanın dirəgi!*

Oğuz-türk ruhundakı cəngavərlik yanğısı, bahadırlıq eşqi, yenilməz döyüşçü ehtirası bir əlində qılınc, bir əlində saz olan Qoç Koroğlunun dəli nərəsindən də boy göstərir:

*… Titrəşir ağzım içində*
*Dil bir yana, diş bir yana!*
*…Çəkəndə Misri qılıncı*
*Baş bir yana, leş bir yana!*

Öz tarixi-mədəni mahiyyətinə görə, əsasən, bahadırlıq ruhunun təbliğ və təlqininə yönəlmiş olan ozan sənətinin birbaşa olmasa da, dolayı davamçısı statusunda çıxış edən aşıq sənəti ozanlara məxsus olan söz və musiqi repertuarını, eləcə də ifaçılıq üslubunu öz süzgəcindən keçirərək müəyyən şərtlər daxilində mənimsəmişdir. Belə ki, islamaqədərki düşüncə və inanc sisteminin daşıyıcısı olan ozanların qam-şaman mədəniyyəti ilə bağlı söylədikləri folklor mətnləri – poetik müraciət-nidalar, alqış-dualar, rəvayətlər, dastanlar və s. yeni dini dünyagörüş – islam təməli üzərində ortaya çıxan dərviş-aşiqlər (XIII-XV) tərəfindən ya tamamilə qəbul edilmir, ya da dəyişdirilərək yeni məzmuna – sufi-dərviş dönyagörüşünə uyğunlaşdırılırdı. Haqq-ilahi eşq aşiqləri olan dərviş-aşiqlər ozan qopuzunu aşıq sazı ilə əvəzləyərək təsəvvüf dünyagörüşünü – «Vəhdətü-Vücud» (Vücudla-Allahla vəhdətə girmək) fəlsəfəsini təbliğ-tərənnüm yolunu tutmuşdular. Dörd mərhələdən (şəriət, təriqət, mərifət və həqiqət) keçərək Haqqa – Allaha qovuşmağın mümkünlüyünə inanan Haqq aşıqları özlərinin musiqi və söz repertuarında da əsas yeri bu mövzuya verirdilər:

*Laməkan şəhrindən gəldim cahana,*
*Canlar əhli bir canana yetişdim.*
*Əldən-ələ, qabdan-qaba süzüldüm,*
*Qətrə idim, bir ümmana yetişdim.*

Göstərilən nümunədəki bütün ifadələr sufi-dərviş simvolikasını əks etdirir. Sonuncu misrada («Qətrə idim, bir ümmana yetişdim») isə zərrənin bütövə, bəndənin Allaha qovuşması (Vəhdəti-Vücud) rəmzi-məcazi dillə ifadə olunmuşdur. Bu poetik keyfiyyət Səfəvi-qızılbaş ideologiyasına xidmət edən bütün orta çağ aşıqları üçün səciyyəvidir. Onun bir çox uzantılarını hətta on doqquzuncu yüzillikdə və iyirminci yüzilliyin əvvəllərində (Hüseyn Şəmkirli, Aşıq Ələsgər, Hüseyn Bozalqanlı, Molla Cuma, Aşıq Şenlik) də sezmək mümkündür.

Sufi-dərviş fəlsəfəsi, təsəvvüf simvolikası orta çağ Azərbaycan məhəbbət dastanlarının poetikasında və tarixi semantikasında da öz dolğun əksini tapmışdır. «Aşıq Qərib», «Yetim Aydın», «Qurbani», «Abbas və Gülgəz», «Novruz və Qəndab», «Seydi və Pəri», «Abdulla və Cahan», «Məsum və Diləfruz» sırasından olan rəmzi-məcazi dastanların süjet xəttindən bunu açıq şəkildə görmək mümkündür: ilahi eşq badəsi içirilən Aşıq (haqq aşığı Qərib, Aydın, Qurbani, Abbas, Novruz, Seydi, Abdulla, Məsum və s.) yuxudan oyanır və ona vergi verildiyini söyləyir:

*Yatmışdım, yuxuma gəldi ərənlər,*
*Qafil, nə yatmısan, oyan, dedilər.*
*…Dindirəndə haqq söylədim sözümü,*
*Doxsan min kəlməni bəyan dedilər.*

Doxsan min kəlmənin bəyan olunması Haqq aşığına şəriətin, islam dini ilə bağlı bilgi və təsəvvürlərin mənimsədilməsi anlamındadır. **Şəriət mərhələsi** isə təsəvvüf sistemində Haqqa – Allaha qovuşma yolunun ilkin təməlidir.

İlahi eşq badəsi içirilmiş Haqq aşığı ata-anasından icazə alıb butasının arxasınca səfərə çıxır. Bu, **təriqət – yol mərhələsidir.** O, səfərin-yolun-təriqətin bütün əziyyətlərinə (zəhər quyusuna salınıb sağ çıxır, quldurlara rast gəlib onlardan qurtulur, gözünü bağladıqları halda qarşısından keçən adamları adbaad sayır, divarın və ya pərdənin arxasındakı adamın ovcunda gizlətdiyi əşyanı (almanı, narı, üzümü və s.) təsvir edir və adını söyləyir) qatlaşır. Haqq dərgahı, ilahi aləm tərəfindən himayə olunduğu üçün haqq aşığı qarşısına çıxan çətinliklərdən qurtulub özünün arif-məruf olduğunu bütün səviyyələrdə sübut edərək **mərifət mərhələsində** də öz mənəvi-ürfani kamilliyini göstərmiş olur. Maraqlıdır ki, bu mərhələdə haqq aşığı qarşısına çıxan məşhur aşıqları məhz sufi-dərviş simvolikasından istifadə edərək çaş-baş salıb məğlub edir. Bütün sınaq və imtahanlardan qalib, üzüağ çıxan aşıq son olaraq öz butasına yetişmək hüququ qazanır və bununla da **həqiqət (Haqqa qovuşma) mərhələsi** ilə uzun və məşəqqətli mücadilə tamamlanıb başa yetir. Sözügedən mənzərə onu göstərir ki, aşıqlıq öz tarixi səciyyəsinə görə təkcə çalıb-çağırmaq, musiqi-əyləncə sənəti deyil, özünəməxsus poetikası və ideoloji istiqaməti olan möhtəşəm fəlsəfi sistemdir.

«Aşıq haqq aşığıdır», «Aşıq el anasıdır», «Aşığa zaval yoxdur», «Aşığın dilinə yasaq yoxdur», «Aşığın sözü haqq sözüdür», «Aşıq gördüyünü çağırar» kimi daşlaşmış el kəlamlarından aşığın cəmiy-

yətdə, el-oba arasında nə qədər böyük tarixi status, mötəbər mövqe daşıdığı aydın görünməkdədir. Əlbəttə, belə yüksək ehtiramın çeşidli səbəbləri vardır. Burada xalqın tarixi-mədəni yaddaşını qoruyub daşımaqdan tutmuş, zəngin həyat təcrübəsindən gələn müdrik kəlamlarla, hikmətamiz ustadnamələrlə çevrədəkilərin mənəvi tələbatını ödəmək, lirik-aşiqanə qoşma-gəraylılarla gözəllik və məhəbbət zövqü aşılamaq kimi çoxsaylı amillər əsas rol oynamışdır.

Aşıq xalqın ruhunu, mənəvi varlığını dərindən bildiyi və məhz xalqın ürəyindən keçənləri dilə gətirdiyi üçün xalq onu el anası adlandırmışdır. El anası olan aşıq elin, xalqın psixologiyasını, əxlaq qanunlarını, yüzillərin sınağından keçmiş mənəvi dəyərlərini, həyat təcrübəsindən doğan müdrik düşüncələrini özünün düzüb-qoşduğu şeirlərdə elə bir ölçü-biçiylə, poetik mizan içərisində təqdim etmişdir ki, xalq həmin sözləri ustad kəlamı, ustad sözü – ustadnamə sayaraq dilinin əzbərinə çevirmişdir. Qədim oğuz cəmiyyətində Dədə Qorqudun söylədiyi:

*Əsgi panbuq bez olmaz,*
*Qarı düşmən dost olmaz…*

***

*Oğul atanın yetiridir,*
*İki gözünün biridir…*

***

*Qız anadan görməyincə ögüt almaz,*
*Oğul atadan görməyincə süfrə açmaz…*

– kimi kəlamlarla, ata sözlərimizlə təməli, özülü qoyulan ustadnamələrin Qurbani, Tufarqanlı Abbas, Xəstə Qasım, Dədə Ələsgər poeziyasında biri-birinə tən duran çox sayda tutarlı örnəklərinin olması həm aşığın, həm də onu dinləyən elin-elatın bu məsələyə tarix boyunca olduqca həssas yanaşmasından xəbər verir:

*Söz bir olsa, dağ oynadar yerindən,*
*El bir olsa, zərbi gərən sındırar.*

(Abbas Tufarqanlı)

***

*Yaxşı igid yaman etməz adını,*
*Çünki yaman addan ölüm yaxşıdı…*

***

*Sərv ağacı hər ağacdan ucadı,*
*Əsli qıtdı, budağında bar olmaz…*

***

*Üz vermə nadana, sirr vermə pisə,*
*Axır qəlbin ya inciyə, ya küsə.*
*Ot bitər kök üstə, əsli nə isə,*
*Yovşan bəsləməklə çəmənzar olmaz*

(Xəstə Qasım)

***

*Can deməklə candan can əskik olmaz,*
*Məhəbbət artırar, mehriban eylər.*
*Çor deməyin nəfi nədi dünyada,*
*Abad könlü yıxar, pərişan eylər.*

(Aşıq Ələsgər)

***

*Qurban, qəm eyləmə, kərəm kanı var,*
*Ədalət meydanı, haqq divanı var.*
*Qaldıran, endirən nərdivanı var,*
*Enən ağlayarmış, qalxan gülərmiş.*

(Ağdabanlı Qurban)

Bütün bunlar onu göstərir ki, Ozan-aşıq mədəniyyətinin ortaya qoyduğu poetik sərvət sözün həqiqi mənasında milli-mənəvi varlığımızın başucalığıdır: burada ana dilimizin incəlikləri, söz-səs düzümünün harmonik axarı, bədii mənalandırma və fəlsəfi ümumiləşdirmə məharətinin ağılaparan poetik maneraları bütün zamanların – dünənin, bu günün və sabahın estetik zövqünü heyrətdə qoymaq gücündədir:

*Bəri gəlgil, başım baxtı, evim taxtı,*
*Evdən çıqub yürüyəndə səlvi boylum!*
*Topuğunda sarmaşanda qara saçlum!*
*Qurulu yaya bənzər çatma qaşlum!*
*Qoşa badam sığmayan dar ağızlum!*
*Güz almasına bənzər al yanaqlum!*
*…Qar üzərinə qan dammış kimi al yanaqlum!*

Ozanlar piri Dədə Qorqudun yuxarıdakı portret təqdimatının hər bir elementi (boy, saç, qaş, ağız, yanaq) özünün bədii boya mükəm-

məlliyinə görə unikal bir poetik örnəkdir. Oğuz gözəlinin bu heyrətamiz portreti, ilahi bir tablonu ozan nəfəsindən, qopuz sədalarından qopan sehrli bir ilğıma bürüyərək tarix içindən bizə doğru daşıyır. Bu səbəbdən də orta çağ Azərbaycan aşıq poeziyasındakı hüsn-gözəllik tabloları da Dədə Qorqud poetik ənənəsini yeni bir təravətlə canlandırır. Dirili Qurbaninin:

*Sallana-sallana gələn Salatın,*
*Gəl belə sallanma, söz dəyər sənə*

– deyə ozanlara məxsus alliterasion-reçitativ söyləmə tərzi ( misal gətirilən misralarda poetik axarın «s» səsi üzərində qurulması) ilə təsvir və tərənnümə başladığı məşhur qoşmasında Dədə Qorqud nəfəsini davam etdirdiyi açıq şəkildə duyulur:

*Kölgədə bəslənmiş quzey qarısan,*
*Səhərin yelləri tez dəyər sənə.*

Qurbani peyzaj lirikasında da poetik istedadının portret yaratma ustalığını özünəməxsus sənətkarlıqla nümayiş etdirir. Duruşu, rəng çalarları və qoxusuna görə sazı-sözü əbədi olaraq öz sehrində, cazibəsində saxlayan bənövşə obrazı ilə bağlı böyük söz ustadının dilə gətirdiyi misralar heç də təsadüfən yüzillər boyu ana sazımızın sinəsində yuvalanmayıb:

*Tanrım səni xoş camala yetirmiş,*
*Səni görən aşiq ağlın itirmiş.*
*Mələklərmi dərmiş, göydən gətirmiş?!*
*Hayıf ki, dəriblər az bənövşəni.*

Buradakı gözlənilməz poetik mənalandırma (bənövşənin ilahi aləm-mələklər tərəfindən gətirilməsi) o qədər aydın, duru və şəffaf bir dillə təqdim olunmuşdur ki, sözlərin, misraların, bütövlükdə isə şeirin Haqq dərgahından aşıq-şairin könlünə pıçıldanmasına, ərməğan olunmasına inanmaya bilmirsən. Gözəl hüsnünün estetik dəyərləndirilməsində gözəllik simvolu olan bənövşədən ağlasığmaz bir poetik meyar kimi istifadə olunması da elə bu zaman baş verib:

*Dəstə-dəstə dərib taxar buxağa,*
*Bənövşə qız iylər, qız bənövşəni.*

Özü qoxu-ətir etalonu olan obraz (bənövşə) üzbəüz qaldığı eyni estetik keyfiyyətə (qız ətrinə) meyl göstərir. Aşıq demək istəyir ki, qızın boynu-buxağı o qədər gözəldir, o qədər ətirlidir ki, onun iylədiyi bənövşə bu sehr-cazibə qarşısında özünü saxlaya bilməyib qızı qoxlayır. Məhz belə bir sənət ecazı «Bənövşə» qoşmasına saz sinəsində yüzillər boyu əzizlənmək ixtiyarı tanıyıb. Bu ilahi qoşma öz bədii-estetik tutumuna görə divan ədəbiyyatının istənilən mükəmməl nümunəsi ilə üzbəüz dayanmaq imkanındadır. Burada məsələnin bir başqa tarixi-mədəni əhəmiyyəti də ondadır ki, orta çağ divan ədəbiyyatı nümayəndələri ərəb-fars ibarə və tərkiblərinə sığınaraq gücənə-gücənə «nəzmi-nazik» qoşmağa çalışdıqları bir zamanda Qurbani dumduru, apaydın el dilində yaratdığı «Bənövşə» qoşmasının simasında Azərbaycan türkcəsinin hansı səviyyədə poetik imkanlara malik olduğunu elə onların gözlərinin önündə və qulaqlarının dibində səsləndirib. «Bənövşə» şeiri çağdaş poeziyamızın özünü belə heyrətdə qoya biləcək dərəcədə mükəmməl bir sənət abidəsidir.

Təsvir-tərənnüm obyektinə özünəməxsus saz-söz sığalı çəkmək Abbas Tufarqanlı, Xəstə Qasım, Sarı Aşıq, Abdalgülablı Valeh, Yəhya bəy Dilqəm, Hüseyn Şəmkirli, Aşıq Ələsgər, Hüseyn Bozalqanlı, Molla Cümə, Növrəs İman, Dədə Şəmşir, Mikayıl Azaflı və daha neçə belə ustadın könül dünyasında ovsunlayıcı poetik nəfəsin ortaya çıxması ilə nəticələnib. Onların sinəsindən pərvazlanan qoşma-gəraylılar, çoxsaylı çeşidlərə malik təcnislər, divanilər, müxəmməslər bunun əyani sübutudur. Abbas Tufarqanlı könlünün gözəlin qaşları qarşısındakı heyrətinə bir bax:

*Dərs almamış açdım kitab oxudum,*
*Möhtac deyil heç ustaya qaşların.*
*Təzə çıxıb kamandarın əlindən,*
*Bənzər üç gecəlik Aya qaşların.*

Aşıq əhvalının gözəllik qarşısındakı dumanlı, çaşqın, havalı halının aşağıdakı poetik etirafı da dildən-dilə, könüldən-könülə yayılmağa layiqdir:

*Dil deyir, öpməyə sinə yaxşıdır,*
*Könül ha yalvarır, buxağından öp!*

Xəstə Qasımın könül dəftərində görüşə gələn sevgilinin elə bir unudulmaz obrazı yaradılıb ki, şeiri oxuduqca bu naz-qəmzəli qızın hüsn-

camal təravəti ilə bərabər hərəkət-davranış ədaları da bədii-estetik duyumun tərkib hissəsinə çevrilir:

*Gümüş kəmər bağlayıbdı belinə,*
*Danışdıqca mayıl oldum dilinə.*
*Gül uzatdım nazlı yarın əlinə,*
*Canım aldı, gülü məndən alınca.*

Gecəsi gündüzünə qarışan Abdalgülablı Valehin pərişan halını sevdiyinə ərz eləməyi də bənzərsizdi:

*Gündüz səbrü-qərarımı,*
*Gecə yuxum kəsən dilbər.*

Həsrət, ayrılıq iztirabının Dilqəm göynərtisi – küsüb gedən yarın qayıdışına inamsızlıqla, ümidsizliklə ovuducu, təskinlikverici təsəlli arasında çırpınan aşiq yanğısı sazın bağrını tel-tel eləyən söhbətlərdəndir. «Dilqəmi» saz havasının nisgilli melodiyaları qədər təsirli olan kövrək misralar nələrdən xəbər vermir:

*Axdı eynim yaşı, döndü sellərə,*
*Yar içən sulara qarışarmola?!*
*…Yarı bu dünyada görməyən Dilqəm,*
*Yarəb, o dünyada görüşərmola?!*

Yaxud:

*Əzəldən Dilqəmə yar olan sənsən,*
*Gözəllər içində var olan sənsən.*
*Əzrayıl donunda can alan sənsən,*
*Mən necə can verim bir özgəsinə.*

Umu-küsüsünü dolayı dillə söyləyib, qəm-qübarını əritməkdə ona yardım eləməyən dağlardan şikayətlənən Hüseyn Şəmkirlinin gileygüzarı poeziyamıza:

*Yeri, dağlar, sənnən həmdəm olmaram,*
*Dağlar, əsirgədin qarı da məndən*

– kimi bütün sınıq könüllərə həyan ola biləcək həzin misralar bəxş edibdir.

Sevgisinə, sevdiyinə can qurban eləməyin Aşıq Ələsgər örnəyi:

*Bir canım var, yara qurban eylərəm,*
*El desin: «Aşıq da qurban öldürür».*

Yaxud:

*… Qazdır məzarımı çeşmə başında,*
*Sal sinəm üstündən yol, incimərəm*

– sırasından olan təkrarsız misralarda dalğalanır.

Bu da Hüseyn Bozalqanlı könlünün təbiət və insan gözəlliyinin vəhdətindən doğan harmoniyaya verdiyi aşıq dəyəri:

*Yar bəzənib çıxdı yola,*
*Yollar qırmızı geyindi…*

Dədə Şəmşirin estetik zövqündəki orijinallıqdan da doymaq olmur:

*Şəmşiri bir kəmər kimi,*
*Dola, incə belə sarı.*

Söz sərrafı olan dədə aşıqlarımız hər zaman düzüb qoşduqları sözün çəkisinə, düzümünə, rəng çalarlarına çox böyük həssaslıqla yanaşmış, söylədikləri mətləbin dərinliyi ilə yanaşı, deyim biçiminin orijinallığına və heyranlıq doğurmaq imkanlarına xüsusi diqqət yetirməyə çalışmışlar. Sözün məna və rəng çalarlarının çeşid zənginliyini ortaya qoyan cinas bayatılar, cinas gəraylılar, dodaqdəyməzlər, diltərpənməzlər, nəfəsçəkməzlər, cığalı təcnislər, zəncirləmələr, qoşayarpaqlar, güllü qafiyələr, müəmmalar, vücudnamələr, qıfılbəndlər, müxəmməslər və neçə belə şeir şəkilləri məhz böyük istedad gücünə arxalanan sənət axtarışlarından sonra araya-ərsəyə gəlib. Mənsub olduğu xalqın dilini sözün əsl mənasında sərraf gözü ilə incələyən Sarı Aşığın bir bayatı ustadı kimi söz seçimini və onu poetik yüksəkliyə qaldırma məharətini xatırlayaq:

*Zülfün suda mar kimi,*
*Oynar su damar kimi.*
*Cızıldatdın Aşığı,*
*Yağa su damar kimi.*

Yaxud:

*Aşığın baxtı yarım,*
*Neyləsin, baxtı yarım.*
*Üzündə göz izi var,*
*Sənə kim baxdı, yarım?!*

Hər iki bayatı həm söz, cinas, həm fikir tutumu, həm də poetik mənalandırma ustalığı baxımından orijinal və təkrarsızdır.

Abbas Tufarqanlının «Gülgəzindi» rədifli məşhur cinas gəraylısı təkcə qafiyələrin deyil, bütövlükdə bənd boyundakı misraların cinas olması ilə dinləyəni heyrətdə qoyur:

*Yarı ağ libasda gördüm,*
*Yarı ağlı bada gördüm,*
*Yarı ağlı bada gördüm,*
*Gülgəz, indi, Gülgəz, indi.*

Aşıq birinci misrada yarını – sevgilisini ağ libasda – ağ paltarda gördüyünü deyir. İkinci misrada isə yarının ağlı bada getmiş – ağlını itirmiş vəziyyətdə olduğunu söyləyir. Bunun səbəbini isə üçüncü cinas misrada açıqlayır: Aşıq Abbasın sevgilisi əlində yarıya qədər ağı-zəhər doldurulmuş badə ilə ona yaxınlaşır. Düşmənlərin bu məkrli fəndi Haqq aşığı Abbasa əyan olduğu üçün o, ağ libasda – ağ paltarda ağılı-zəhərli badə gətirən sadəlövh sevgilisi Gülgəzə bu barədə xəbərdarlıq edir. Göründüyü kimi, boyaboy cinas üzərində qurulmuş bu gəraylı bəndində bir dənə də artıq, yersiz, mətləbə dəxli olmayan söz yoxdur. Gəraylının digər bəndlərində də vəziyyət belədir. Bu, ana dilimizin, Azərbaycan türkcəsinin bayramıdır, sazın-sözün aşıq poeziyasındakı möhtəşəm poetik təntənəsidir!

Cinas ustalığı, təcnis sənətkarlığı aşıqlıq elminin ən dərin və hikmətamiz məqamlarından biridir. Məhz özünəməxsus saz havası ilə («Təcnis» havası) çalınıb oxuna bilən, başqa hər hansı bir havaya yatmayan bu sirli poetik mətnlərin aşıq sənətindəki yerini və dəyərini böyük söz ustadı Xəstə Qasım çox dəqiq müəyyənləşdirmişdir:

*Xəstə Qasım, sözün yetir tamama,*
*Gündoğan, Günbatan gəlsin salama.*
*Nə alim işidir, nə də üləma,*
*Təcnis mənasının çox hünəri var!*

Doğrudan da, təcnisin otuza yaxın növündə özlərinin söz məharətini isbatlayan Dirili Qurbaninin, Abbas Tufarqanlının, Xəstə Qasımın özünün, Hüseyn Şəmkirlinin, Aşıq Ələsgərin, Hüseyn Bozalqanlının, Çıldırlı Aşıq Şenliyin, Molla Cümənin, Ağdabanlı Qurbanın, Aşıq Şəmşirin, Mikayıl Azaflının, İsmayıl Sadıxlının təcnis sənət-

karlığına diqqət yetirdikdə görürük ki, «Təcnis» mənasının çox hünəri var» – misrası boşuna deyilməyib.

Xəstə Qasımın «Ay hayıf-hayıf» rədifli məşhur cığalı təcnisinin aşıqların dilindən düşməməsində, əlbəttə ki, aşıq-şairin söz hünəri – cinas seçimi, dərin fikir ifadəetmə və yüksək səviyyəli bədii don geyindirmə qabiliyyəti həlledici rol oynamışdır:

*Sərrafın dəstində nə danə gördüm,*
*Mürğü dəhanında nə danə gördüm!*
*Aşıq nə danə gördüm,*
*Xalın nə danə gördüm,*
*Tülək tərlan tuş oldu,*
*Axır nədanə gördüm.*
*Gövhəri verdilər nadanə, gördüm,*
*Bilmədi qiymətin, ay hayıf-hayıf!*

Təcnisin çeşid zənginliyinə, mürəkkəb poetik maneralarına xüsusi diqqət yetirən Dədə Ələsgərin yaratdığı örnəklər də qüdrətli saz sərrafının sinəsindən qopmuşdur:

*Qışda dağlar ağ geyinər, yaz qara,*
*Sağ dəstinlə ağ kağıza yaz qara.*
*Əsər yellər, qəhr eləyər yaz qara,*
*Daşar çaylar, gələr daşlar çataçat.*

Bu təcnis dodaqdəyməzdir, aşıq onu yaradarkən dodaq (m,b,p) samitlərindən istifadə etməyib. Məsələ burasındadır ki, ustad sənətkar sözügedən təcnisi məqsədyönlü şəkildə dodaqdəyməzlə ifadə etmişdir. Onun yaratdığı peyzaj – təbiət lövhəsi (yazda qarların əriməsi, çayların daşması, sellərin nəhəng daşları-qayaları çathaçatla qabağına salıb aparması) qorxu-heyrət yaradan bir mənzərədir. Bu qorxu – heyrət-hürkü yaradan mənzərəyə insan oğlu dəhşətə gəlmiş vəziyyətdə, ağzı açıq – dodaqları aralı halda, heyrət və təşviş içərisində baxır. Aşıq Ələsgər məhz heyrət edərək ağzı açıq – dodaqlar aralı qalmaq təəssüratını yaratmaq üçün həmin məqamın əhvalına uyğun olaraq dodaqdəyməz təcnis variantını seçmişdir. Bu örnək aşıq poeziyasında sözün görünən və görünməyən tərəflərinin nə qədər çox olduğunu bir daha təsdiqləyir.

Aşıq poeziyamızın, eləcə də dastanlarımızın diqqətçəkən bir özəlliyi də saz-söz yaddaşında vətən coğrafiyasının, tarixi mahal və el-yurdlarımızın, müqəddəs, ulu torpaqlarımızın sıx-sıx yer almasıdır. Dastan qəhrəmanları Təbrizdən, İrəvandan, Dərbənddən, Gəncədən,

Qarabağdan, Qaradağdan, Naxçıvandan, Tiflis-Borçalıdan, Çıldır-Ağbabadan, Göyçədən, Şirvandan, Muğandan, Urmiyadan, Zəncandan, Qarsdan, Səlmasdan, Mərənddən, Marağadan hərəkətlənib yaxın-uzaq elləri dolaşırlar. Təbriz-Qaradağdan yola çıxan Dirili Qurbani:

*Könül qalxıb Bərdə sarı yeridi,*
*Orda bir şəhər var: adı Gəncə, hey!*
*Məhbubları, gözəlləri, xubları,*
*Bürünübdü mala-mülkə, gəncə, hey!*

– misralarını vətən coğrafiyasını və onun adıbəlli mahallarını yaxşı tanıdığını bildirmək üçün söyləyir.

Aşıq Qərib Təbrizin tərənnümünə həsr etdiyi məşhur qoşmasında Azərbaycanın tarixi-mədəni mərkəzi olan bu qədim şəhərin zəngin ticari-iqtisadi həyatından, memarlıq abidələrinin möhtəşəmliyindən, axar-baxarlı mənzərələrindən qürurla söz açır:

*Təbrizin ətrafı bağdı, meşədi,*
*İçində oturan bəydi, paşadı.*
*Səkkiz min məhəllə, beş min guşədi,*
*Çarşısı, bazarı, yolu Təbrizin.*

***

*Pəhləvanlar kisvət geyər, yağlanar,*
*Cümlə bəzirganlar burda əylənər.*
*Üç yüz altmış yükü birdən bağlanar,*
*Əldən-ələ gəzər malı Təbrizin.*

Təbrizdən Dərbəndə qonaq gələn Abbas Tufarqanlı Dəmirqapı Dərbəndi tərənnüm edərkən də öz heyranlığını və vətən coğrafiyasına vurğunluğunu ürəkdən gələn ən səmimi sözlərlə dilə gətirir:

*Dərbənd dedikləri bağçadı, bağdı,*
*Alt yanı dəryadı, üst yanı dağdı.*
*Abbas deyər, əcəb səfalı çağdı,*
*Xəstəyə dərmandı narı Dərbəndin.*

Yüzilliklərdən daşınıb gələn aşıq poeziyası Azərbaycanın tarixi coğrafiyasını, vətən xəritəsini doğru-dürüst əks etdirən ən mötəbər qaynaqdır. Bu mənada aşıq poeziyasının tarixi mənzərəsində həm də Azərbaycanımızın birliyi, bütövlüyü, ayrılmazlığı qərarlaşıb.

QƏMKEŞ ALLAHVERDİ – 80

Məmməd ASLAN



# ŞEİRİMİZİN DƏLİDAĞ HAVALI QƏMKEŞİ

İçimizdə elə xatirələr var ki, onları bəzən bir ömür oyatmağa ürək eləmirik. O xatirələrlə bərabər öz ömrünün də siminə təzanə vurmuş olursan. Oyanan duyğuları yaşamaq da çətindir. Onları yenidən ovundurmaq da çətin: – nə özümüz sakitləşə bilirik, nə həsrət yumağı olan o acılı-şirinli xatirələr...

Axır ki, yaddaşımı birtəhər dilə tutdum...

Düz üç gün, üç gecə Qəmkeş Allahverdinin unudulmaz xatirələri ilə baş-başa qaldım. Bəzən gündüz fikirləşdiklərim gecə uyumağa başlayınca gerçəkləşir, məni Qəmkeşli günlərə aparırdı.

Doğrudan da, baş-başa qalırdıq, o üç gün müddətində. Gah mən büsbütün onun dünyasına köçürdüm, gah o, mənim ağrılı və ümidsiz günlərimə qayıdır, qəlbimdə, gözümdə, bütün varlığımda sazıyla, sözüylə, sirli-sehrli bir büsat qururdu...

Axır ki, qəlbimə hopub yaşayan Qəmkeşli xatirələrimin çox az bir qismini oyada bildim.

Dolanışıq sarıdan Allah ona xışımla görüm-baxım eləmişdi; nə olmasa da, sazı-sözü vardı. Ya Saz həzrətləri ailəsini dolandırardı, ya Söz həzrətləri. Ən çox da Sazla Söz əl-ələ verib Qəmkeş Allahverdinin dünyasına çəki-düzən verərdi.

Müxtəsəri, Qəmkeşin günü-güzəranı bəd deyildi. Bəs nəydi təxəllüsündən doğan "qəm"keşlik? Yaxından tanıyanlar onun bir hal əhli olduğunu, şənşalayın təbiətini yaxşıca bilirdilər. Amma bu, üzdəki



üzüydü; qəlbinin dərinliklərinə çökməmiş qat-qat kədərin silqətindən az adamın xəbəri vardı. Dərdini hər yetənə söyləmək, ürəyini hamıya açmaq Qəmkeşin xislətinə yad idi. Nələr çəkdiyini kimsəyə sızdırmazdı. Dərdini təkbaşına çəkən ağırtaxta kişilərdən idi. Qəlbində fırtına olanda üzündə nəsə bir ümid işartısı olardı.

Qəmkeş Allahverdi ilə ahıllığımızın ilk çağlarından tapışmışdım: mən ona orta məktəbdə ədəbiyyat dərsi vermişəm, o mənə həyatın özünü öyrədirdi. "Tərəzinin" Qəmkeş olan gözü həmişə ağır basdığını onun sağlığında olduğu kimi Qəmkeşsiz qaldığımız indinin özündə də boynuma alıram.

Rəvayətlərdən mayalanmış bir çox şeirlərim Qəmkeşin duzlu-məzəli söhbətləri ilə araya-ərsəyə gətirmişəm. Toy – mağarda çox böyük ustalıqla söylədiyi, ibrətlərlə dolu söz-söhbətinin vurğunu idim.

Altmışıncı illərdə iki qardaş idik – bir köynəkdə!

Bir itib, bir tapılardıq. O illərdə Qəmkeşin varlığıma necə dərindən hopduğunu iki şeirimdə dilə gətirməyə cəhd göstərmişdim. O zamanlar onu və məni yaxından tanıyanların çoxu bu qoşmaları əzbər bilirdi. Qəmkeşi dərindən duymağımın, mənəvi dünyasına böyük heyranlığımın çox insaflı şahididir o qoşmalar:

*Əl saxla, Qəmkeşim, bu nə əfsundur?*
*Bir dön, gözlərimin heyrətinə bax!*
*Sən sazı çalmadın, könlümü çaldın,*
*O yeddi barmağın qüdrətinə bax!*

Sazı böyük şövqlə çalardı. Yaraşıqlı və dümdüz qaməti ilə birləşəndə saz əlçatmazlıqlardan gəldiyini bir daha gözlər önündə sərgiləyirdi. Xüsusilə oxumadan sazı elə beləcə teyxə çalmağını saatlarla dinləyər və doymazdım. Sazla və sözlə bağlı lirik düşüncələri çox mənalı və ifadəli idi. Dodaqları susub, barmaqları dinəndə onu dinləyən haldan-hala düşərdi:

*Gah məni dondurar, gah məni yaxar,*
*Gah qarlı qış olar, gah güllü bahar!*
*Sim deyil, sinəndən doqquz çay axar,*
*Coşqun dalğaların hiddətinə bax!*

Sazın mənəvi bir çalğı aləti kimi təqdimi də Qəmkeşin coşub-çağladığı vaxt dilə gətirdiyi lirik düşüncələrlə ifadə etsək, Allaha xoş gedər:

*Bağrı dəlik-dəlik, yaralı-yasdı...*
*Ağlasan ağladar: elə həssasdı!*
*Dədəmiz Qorquddan bizə mirasdı,*
*Bir sirli taxtanın hörmətinə bax!*

Mənəvi mirası namusu kimi qoruyurdu Qəmkeş. Miras əmanətdir. Dünyamızın ağıllı vaxtı əmanətə məhz bu mənada xəyanət etməzdilər.

Söz əmanəti soyumuzun ən qiymətli mirasıdır. Qəmkeş Allahverdi bu misrasın ən həssas mücahidi kimi özünü təsdiq edirdi. Sözün dəyər itirməsinə, aşınmalara, tərk edilməsinə heç cür tablaşmırdı. Ağlar bir ürəkdə sözün ucuzlaşmağından burulub-bükülürdü. Sözün dəyər itirməsiylə dünyanın yoxluq uçurumuna üz tutduğunu peyğəmbərcəsinə söyləyirdi:

*Mən necə söyləyim hikmətli sözlər,*
*Axı söz gedirmi söz qiymətinə?*
*Zaman seçə bilmir yaxşını pisdən,*
*Çox astar satılır üz qiymətinə...*

Astarın üz qiymətinə satıldığı bir zamanda saz-söz ustadı olan kimsə Qəmkeş olmazdı?! Sözün qiymətdən düşməsi zaman-zaman böyük söz sərraflarını acı-acı düşünməyə vadar eləyib. Füzuli dədəmiz zamanından narazılığını "Əşar bulub kasadi-bazar" nöqtəsinə daşıyır, söz bazarının kasadlığını dünyanın mənəvi dəyərlərinin ifası kimi qiymətləndirir. Üz astar qiymətinə satılırsa, insaf-mürvətin, insani münasibətlərin əsaslı laxladığını şair diqqətlərə çatdırır.

Əsrlər boyu insanları narahat edən cəmiyyət çəki-düzəni nə zamanacan belə davam edəcək, görəsən?..

*Ola mərhəməti haqq-divan hanı?!*
*Ayıra bir-birindən yaxşı-yamanı.*

*Veriblər nadana zəri-zibanı,*
*Alıb sata bilmir düz qiymətinə...*

Belə bir dünyada şair Allahverdi dönüb Qəmkeş olmasınmı?! Şair olan kimsə soyunun və ümumən bəşərin dərdlərini düşünmək üçün dünyaya gəlir. XX əsrin qüdrətli şairi Nəcib Kısakürək dəyərli şeirlərindən birində buyurur ki:

*Suç bir uzun zəncir: bir ucunda mən varam...*

İşlənən suçun və cinayətin suç ortağı həm də onun olduğunu qəbul edən şairə min əhsən!

*Xəyalım qəmlərdən heç olmur ayaz,*
*Sınasan, qələmim, nə yarat, nə yaz.*
*Qəmkeş, gəl ulağa çullama atlaz,*
*Onu da satacaq öz qiymətinə.*

Bu həssas ürək sahibi, Qəmkeş olmasın, kim olsun deyirsiniz?

Toy–mağarda çiçəkli dağları vəsf edəndə, el gözəllərinə gözəlləmə söyləyəndə zahirən kefi ala buludda olan Qəmkeşin daxili dünyasına enməyə məharəti olanlar bu şairin lalə kimi bağrıyanıq halını, təkrar edim ki, dərindən dərk edirdi. Dostlarının çoxu elə misal çəkdiyim o bağrıyanıqlar idi.

Aramızda uzun müddət davam etmiş çox səmimi münasibətə dayanaraq Qəmkeşi bir az zəmanəyə yaxın əhval-ruhiyyəyə səsləməyə çalışmışam, qəlbində tüğyan edən alovlara su səpmək istəmişəm.

*Qəmkeş Allahverdi, dağıt qəmini,*
*Nə qəmli, nə kefli, miyana dolan.*
*Yapış zamanədən, gəlmə zavala,*
*Çərx hara dolansa, o yana dolan.*

Yaxşıya yaxşı, pisə pis davranmağa səsləmişəm Qəmkeşi. Əbəs cəhd etdiyimi elə o vaxtlar dərk etmişəm. Qəmkeş yaxşıya da mülayim idi, yamana da. Öyrətməklə "dəli könlü öyüd almazdı".

*Kömək ol, arxa ol, imkansız görsən!*
*Sən də amansız ol, amansız görsən.*

*Varlığı zəhərli imansız görsən,*
*Gürzə ol, o şahmar ilana dolan.*

Abrını abır bilməzdən satın almağı ona şüar etmək istəmişəm... Atılan gülləyə sinəsini hədəf etmək comərdliyi vardı. Şəxsi mənafeyi üçün göz göyərdib, üsyan etməzdi; ümuminin mənafeyi üçün coşan gördüm Qəmkeşi müdam. Qəzəbində üzünün və gözünün amansız bir ifadəsi vardı. İnanmazdın ki, qəzəb saçan bu gözlər bundan əvvəl işığına, şirin gülümsəmə ifadəsinə heyran qaldığın o gözlərdi, bozarıb daş kəsilən bu üzlər o dünənki təzə gül yarpağı kimi bürüşüksüz təzə-tər ləçəklərdi... Metal dişlərin də bir daha aydınlatdığı hələ o dodaqlar. Bu yar-yaraşıqda az-az aşıq görmüşdük. "Görmüşdük" dedim, Qəmkeş Allahverdi sıra etibarı ilə Dəlidağın indiki nəslinin gördüyü üçüncü böyük el aşığı idi. Özündən əvvəlki Ağdabanlı şair Qurbanın, onun oğlu Dədə Şəmşirin sənətdə qanuni davamçısıydı. Bu səbəbdən xalq arasında halal bir mötəbərlik qazana bilmişdi. Bayaqkı ithaf şeirimin davamına qayıdıram:

*...Çox da ki, dünyadan şər əskik olmaz,*
*Bu eldən-obadan ər əskik olmaz!*
*Qorxma, məclisindən ər əskik olmaz,*
*Sazı bas sinənə, meydana dolan!*

*Məmmədi özündən uzaqda gəzmə!*
*Gücünü sözdə gəz, yaraqda gəzmə!*
*Allahı qəlbindən iraqda gəzmə,*
*Məkkə, Mədinə bil, vicdana dolan!*

Geniş xalq kütləsinin məhəbbətinə arxayınçılığından idi ki, Qəmkeş toy-mağarda özünü xatircəmliklə sərbəst hiss eləyərdi. Bugünkü toy qardaşağası hay-küyü onun məclisinə üzükə bilməzdi. Təşrif gətirdiyi şənlik evinin əsl sahibi Qəmkeşin özüydü. Özündən arxayın o sərbəst dövran ona çox yaraşırdı!...

Dilində bir-birindən səsləniş etibarı ilə çox az fərqlənən iki nida vardı: "bəh" və "bah".

Gözəllik qarşısında heyrətinə güzgü tutan "bəh" nidasını ən azı beş dəfə təkrar edərdi: "bəh-bəh-bəh... bəh! bəh!" Amma necə deyərdi?! Onun ruhi vəziyyəti necə şuxluqla, necə könül rahatlığı ilə bu "bəh-bəh" nidasında arı zümzüməsinə dönərdi, dəniz sakitliyində birdən-birə dalğa pıçıltısı olub bir gözəllik büsatı yaradardı. Qəmkeş bu nidanın məqamını

çox həssaslıqla seçirdi. Onun böyük ifaçılıq sənətinin cığasıydımı, ləngəriydimi, zər-zibasıydımı?! – Nəydisə, Qəmkeşin varlığını tamamlayan vazkeçilməz bir ünsür idi!...

"Bah" nidası da onun əmri altında ayrı bir şeyə dönmüşdü. Birisinə yazığı gələndə, bir qəbahətkeşin yerinə utananda, bir fəlakətdən sarsılanda Qəmkeş bu nidanı necə üzülə-üzülə, necə təəssüf keçirə-keçirə, necə qınaqla dolu daşa-daşa dilə gətirərdi. Deməyim ki, bu nida onun humanizminin ən ümdə təyinedicisi sayıla bilərdi. O məqamda şair Qəmkeş birdən-birə yaşlaşıb dünyayla yaşıd olardı!...

Bu qəbildən sənətkarlar dünyalarını dəyişəndən sonra əldə və dildə qalan onların könül duyğuları olan şeirlərdir. İnsafla desək, Qəmkeşin özündən sonra xışmıla nəfəs közərtiləri var. Ağız ədəbiyyatının hər janrında söz meydanında at oynatmış bu ulumuzun bədii irsi içərisində "Yatıbdı" rədifli iri həcmli qoşma-ustadnaməsi Qəmkeşin fəlsəfi düşüncələrinin məcmusudur. Deyim ki, Qəmkeşi xalqa ən çox yaxınlaşdıran bu əsəri oldu. Bir zamanlar vardı ki, bu ustadnaməni bilməyən aşığı məclisə qoymazdılar. Əslində bu nöqtədə "insan uyğudan ayılır" və kimliyi daha bariz şəkildə baş qaldırıb üzə çıxır. Şəksiz ki, son nəfəs əbədiyyət deyilən gedər-gəlməzliyin qapı ağzıdır. Ömrümüzün hasili burada birdən-birə üzə çıxır: əbədiyyət karvanına üz tuturuq. O karvanda irəliləmək səlahiyyətini, əlbəttə, sağ ikən əldə etdiyimiz ömrümüzün əmsalı olan qalıcı mənəvi varlığımız müəyyənləşdirir.

İlk insandan və ilk ölümdən yönü bəri yol gələn bu acılı-şirinli axirət düşüncələrini "Yatıbdı" qoşmasına Qəmkeş Allahverdi, deyərdim ki, çox böyük hünər və səriştə ilə misra memarlığına gətirməyi bacarmışdır:

*Bu gün yolum düşdü qəbiristanlığa,*
*Orda zaman qışdı, dövran yatıbdı.*
*Sanki pıçıldadı hər məzar daşı:*
*– Şair, asta yeri, insan yatıbdı...*

Bu şeirdə bir qəbiristanlıq havası, əbədiyyət təmkini, bir sükut təmkini var. Qəmkeşin varlıq və yoxluqla bağlı fəlsəfi düşüncələri bu sükut təmkininə yönəlmişdir.

Qəbiristanlıq sönmüş ehtiraslar məskəni, puç olmuş arzular, daşa dəymiş diləklər vadisidir. Bütün bunlarla bərabər hiylənin, xəbisliyin, kin-küdurətin, bütünlüklə dünyəvi ehtirasların daş kəsildiyi bir aləmdir.

Bu aləmdə:

*– Şöhrətə uyanlar üryan yatıbdı.*

yaxud:

*Şaha baş əyməyən nazlı afətin,*
*Qəbirdə qoynunda ilan yatıbdı.*

və yaxud:

*Atılıbdı daşı zülmün-zillətin,*
*Ora güzgüsüdür bir həqiqətin.*
*Haruntək aşnası varın-dövlətin,*
*Olub qurda-quşa ehsan, yatıbdı.*

Bir bərabərlik səltənəti ki;
– "Pul işləmir orda, qiymətsizdi zər", "Ağadan yuxarı çoban yatıbdı", "Şöhrət yuvasında şeytan yatıbdı"...

Qəmkeşin qaşı kimi bu sükut aləminin də qaşı çatılıb. Şair içindəki ictimai haqsızlıqları ayağı altına qoyub, zülmə-sitəmə sanki "son qoymaq" istəyir. İbrətlər silsiləsi olan bu ömürlü qoşma, yəqin ki, zaman-zaman kara gələcək, insanlar arasında dipdiri qalma məziyyətlərini davam etdirəcək...

Qəmkeşə verilmiş çoxsaylı fəaliyyət bir nöqtədə birləşdiyi günün ağrı-acılı duyğuların matəm mərasimini mən yönəldirdim.

Üzüntülərin hıçqırtılara çevrildiyini, dünyanın bu çağında, hətta saçyolduların, bayılmaların dörd yanımda sıx-sıx duyulduğu, dünyadan bir şair nurunun da azaldığı ömür hesabatı mənə çox böyük ibrətləri xatırladırdı. Yəqin bu səbəbdən fikrimi cəmləyə bilmirdim.

Peyğəmbər sözüdür: "İnsanlar uyğudadır, ölüncə dirilirlər..." Tabutunu bürüyən iniltilər, hıçqırıqlar arasında bu müdhiş el məhəbbətindən Qəmkeşin əbədiyyət karvanına qoşulmaq üçün mənəvi dirilişinin ilk nəfəs atışlarını duymağa başlamışdım. Onsuz da əsl şair ömrü ölümdən sonra başlanır. "Şair, sən üzüldükcə və öldükcə yaşarsan!..."

Həsədverici bir ölüm idi Qəmkeşin fiziki ölümü. Onu sevənlərin qəbri üstünə düzdükləri təzə-tər çiçəkləri göz yaşları gur bir yağmura tutmuşdu.

Bu sevgi yağmuru qoymaz, inşallah, o çiçəkləri quruyub solmağa!

Qəmkeş kimi təbii şairlər yada düşdükcə yenidən dirilirlər.

**10 avqust 2006-cı il**

*Aktual müsahibə*

# "MƏTBUATIN AŞIQ SƏNƏTİNƏ, SAZA DİQQƏTİNİN AZALMASI GÜNÜMÜZÜN ACI REALLIĞIDIR"

**"Mədəniyyətimizin digər sahələri kimi, aşiq sənətinin də təbliğinə böyük önəm verən İctimai teleradio bu baxımdan digər media qurumları üçün layiqli nümunədir**".



*Azərbaycan teleradiosunda, elektron mediada, mətbuatda milli mədəniyyətimizin əsas qollarından olan aşıq sənətinə, saz ifaçılığına münasibət hansı səviyyədədir? Bu sualla müraciət etdiyimiz İctimai Televiziya və Radio Yayımları Şirkətinin əməkdaşı, İctimai radionun "Axşam oldu" verilişinin aparıcısı, saz-söz bilicilərindən sayılan* ***Qorxmaz Tofiq oğlu*** *ilə söhbətimizdə çoxəsrlik tarixə malik aşıq sənətinin KİV-də təbliği barədə danışdıq.*

**– Çalışdığınız media qurumunda – İctimai Televiziya və Radio Yayımları Şirkətində aşıq yaradıcılığının, sazın təbliğatı hansı səviyyədə aparılır?**

– Bu günlərdə 7 yaşını fərəh hissilə qeyd etdiyimiz İctimai Televiziya və Radio Yayımları Şirkətinin yarandığı gündən milli-mənəvi dəyərlərimizin təqdiminə və təbliğinə çox ciddi və vicdanlı bir yanaşması var. İlk dəfə aşıq yaradıcılığı ilə bağlı veriliş televiziyamızdan öncə İctimai radioda efir həyatı qazanıb. Biz əvvəldən sistemli şəkildə bu sənəti geniş təqdim etməyə, sıradan musiqi nömrələri hesabına efiri doldurmamağa, sənətkarları sırf peşəkar yanaşma ilə bütün dinləyicilərə və xüsusən gənc nəslə tanıtdırmağa çalışdıq. Aşıqlar əslində sovetlər dönəmində hakim olan müəyyən bir təbliğat mexanizminin təqdim etdiyi kimi deyil, çox ciddi bir sənətin nümayəndələridir. Bu nöqteyi-nəzərdən aşıq sənətini təbliğ etməyə çalışdıq və düşünürəm ki, məqsədimizə xeyli dərəcədə nail ola bildik. İctimai televiziyada bizimlə bərabər hər həftənin şənbə axşamı "Ozan" verilişi də efirə çıxır. Amma İctimai radioda həftədə altı dəfə efirdə oluruq. Bu zamanı da müəyyən günlərə bölmüşük – ustadların ya-

radıcılığını təqdim edirik, tanınmış aşıqların birbaşa canlı efirimizdə iştirakı təşkil olunur, eləcə də dünyasını dəyişmiş, hətta bir neçə yüz il bundan əvvəl yaşayıb-yaratmış sənətkarların yaradıcılığını folklorşünaslarla, araşdırmaçı alimlərlə təhlil edərək xalqa çatdırmağa çalışırıq. Bu baxımdan İctimai radionun efir siyasəti düzgün və uğurlu qurulub. Çalışırıq ki, aşıq yaradıcılığı ilə, bu sənətin müxtəlif tərəflərilə bağlı silsilə verilişlər, ardıcıllığı pozmadan sanballı proqramlar təqdim edək. İctimai Televiziya və Radio Şirkətinin bu sahədəki siyasəti milli-mənəvi və mədəni dəyərlərin təbliğinə yönəlib. Üzərimizdə olan öhdəliyi həm peşəkarlıqla, həm də vətəndaş mövqeyinə əsaslanaraq təqdim etməyə çalışırıq. Bu işə həm jurnalist, həm də vətəndaş kimi ürəkdən yanaşırıq. Düşünürəm ki, aşıq yaradıcılığının təbliğinə İctimai teleradioda kifayət qədər geniş vaxt ayrılır. Nəzərə alsaq ki, həftənin altı günü radioda, bir günü də televiziyada aşıq proqramı var, bu, olduqca yüksək göstəricidir. Unutmayaq ki, aşıq sənəti hər nə qədər milli musiqimizin genefondu statusunu daşısa da, digər sahələr də unudulmamalıdır. Onlarla da bağlı verilişlər hazırlanması lazımdır. Çağdaş dövrümüzdə klassik irsə söykənməliyik, amma müasirliklə də ayaqlaşmalıyıq. Bu baxımdan bütün sahələri əhatə etməyə çalışırıq, amma aşıq sənətinə, aşıq poeziyasına da yetərincə vaxt ayırırıq. Bu işləri hələ uzun illər görmək niyyətindəyik. Çünki İctimai Televiziya və Radio Şirkətinin rəhbərliyi, hörmətli sədrimiz İsmayıl Ömərov bu sənətə – aşıq yaradıcılığına layiqincə diqqət göstərir. Mədəniyyətimizin digər sahələri kimi, aşıq sənətinin də təbliğinə böyük önəm verən İctimai teleradio bu baxımdan digər media qurumları üçün layiqli nümunədir.

**– Aşıq sənəti ilə yaxından ilgilənən bir jurnalist kimi, başqa telekanallarda, radiolarda, ümumiyyətlə, mətbuatda aşıq sənətinin təbliğatına sizdəki qədər geniş yer verilməməsini nə ilə əlaqələndirərdiniz?**

– Bizim kanal ictimai bir institutdur, çox böyük öhdəlikləri olan media qurumudur. Bu həm öhdəliklərimizin tərkibinə daxil olan bir iş olduğu üçün, bir daha təkrar edirəm, həm də vətəndaş mövqeyi, milli-mənəvi təəssübkeşlik duyğusu sayəsində İctimai teleradio aşıq sənətini, sazı daima diqqətdə saxlayır. Doğrudur, digər kanallarda, radiolarda, ümumən mətbuatda aşıq sənətinin təbliğatı zəifdir. Mətbuatın bir çox sahələrində bu işləri həyata keçirməyə müəyyən cəhdlər var. Amma, görünür, kadr çatışmazlığı və yaxud başqa səbəblər onların bu işi yarımçıq görməsinə, yaxud, ümumiyyətlə, yan keçməsinə səbəb olur. Nəzərə alaq ki, televiziya və radionun nüfuz dairəsi daha genişdir. Təbliğat imkanları, mətbuatın digər sahələrinə baxanda, daha böyükdür. Hətta internet də bu

sahədə onları sıxışdıra bilmir. Yenə də televiziya və radio bir nömrə olaraq informasiya məkanında qalmağa davam edir. Lakin mühüm təbliğat meydanı adlandırdığımız bu efir məkanında yer alan bəzi teleradio kanallarındakı verilişlər, təəssüf ki, aşıq sənətinin əleyhinə işləyir, təbliğatdan daha çox, antitəbliğata xidmət edir. Bilgisizlik də bu məsələdə başlıca rol oynayır. Tutalım ki, bir bölgədən saz ifaçısını, sənətkarı verylişə dəvət edirlər, amma bu sənətdən məlumatları çox səthi olduğu üçün uyğun gəlməyən suallar verirlər, söhbət alınmır, namünasib vəziyyət yaranır, buna görə də tamaşaçıda, dinləyicidə aşığa əks münasibət formalaşır. Yaxud da ustad aşıqların yaradıcılığına dəyər verməməklə, böyük sənətkarları gənclərlə üz-üzə qoymaqla bəzi media orqanları ya ucuz reklam yolu axtarırlar, ya da bu onların milli mədəniyyəti bilməmələrindən irəli gəlir. Amma unutmasınlar, ucuz reklamlar üçün ucuz işlər var. Aşıq sənəti kimi dəyərlər konkret kimlərəsə məxsus deyil, hamımızındır. Aşıq yaradıcılığı saf su kimidir, haramlıq götürməz. Aşıq sənətinin ucuz reklama ehtiyacı yoxdur. Əksinə, bununla manipulyasiya etmək istəyənlər özlərini biabır edə bilərlər. Məncə, bütün kütləvi informasiya vasitələrində aşıq sənətilə bağlı proqramlar bu işi yaxşı bilənlərə, bu sənətə yaxından bələd olanlara tapşırılmalıdır. Düzdür, deyirlər, jurnalist bir çox sahələrdən xəbərdar olmalıdır, amma unutmayaq ki, aşıq yaradıcılığı son dərəcə spesifik bir sənətdir.

**– Sizin fikrinizcə, aşıq sənətinin təbliğatı necə qurulmalıdır? Bu istiqamətdə ayrıca bir konsepsiya yaradılmalıdır, yoxsa bununla təkcə Aşıqlar Birliyi məşğul olmalıdır?**

– Azərbaycan Aşıqlar Birliyi ilə sıx əlaqələrimiz var. Tədbirlərinin ictimaiyyətə çatdırılmasında, işıqlandırılmasında yaxından iştirak edirik. Elə bilirəm ki, bu sahədə işimizi normal qurmuşuq və bir-birimizi başa düşərək işləyirik. Əslində, dediyiniz konsepsiya məsələsi ilə əlaqədar bu işi dərindən bilən insanlar çalışıblar. Onlar ən azından buna təşəbbüs göstəriblər ki, bu işləri bir proqram çərçivəsinə salsınlar. Amma bu daha çox kağız üzərində çıxış olaraq qalıb. Konkret bir konsepsiya mütləq olmalıdır. Aşıqlar Birliyinin və onun sədrinin, öz təbiri ilə desək, aşıq sənətinə təpədən-dırnağa bağlı olduğunu hər kəs bilir və buna kimsənin şübhəsi ola bilməz. Amma hiss olunur ki, Aşıqlar Birliyinin səlahiyyətləri bu sahənin hərtərəfli inkişafı və təbliğinə yetəcək qədər deyil, imkanları məhduddur. Tutalım, orada maddi-texniki bazanın yaradılması, nəzarət olunması vacibdir ki, aşıqlar haradasa öz istədikləri kimi, “ucuz qiymətə kiminsə şeirlərini səsləndirmək” niyyətilə keyfiyyətsiz ifalar yazdırmasınlar. Bununla da kor-koranə, başdansovdu şəkildə hansısa səsyazma studiyalarında həvəskar lent yazılışına son qoyular. Həmin ifaların

efirə, teleradio məkanına yol tapmasının da qarşısı bu yolla alına bilər. Bundan əlavə, konsertlərin təşkili və efirdə işıqlandırılması işi daha da təkmilləşdirilməli, media bu istiqamətdə fəaliyyətini aşıq sənətinə, saza layiq olan səviyyədə qurmalıdır.

– **Mətbuatın, qəzetlərin aşıq sənətinə münasibəti barədə nə deyərdiniz? Bu sahədə vəziyyət necədir, sizcə?**

– Azərbaycanda qəzetlərin aşıq sənətinə münasibətini müxtəlif yöndən dəyərləndirmək olar. Birinci növbədə bunu demək mümkündür ki, milli mətbuat hər zaman sazı, aşıq yaradıcılığını diqqətdə saxlayıb, bu ulu sənətin təbliğinə öz töhfələrini verib. Hələ teleradionun fəaliyyət göstərmədiyi, ya da geniş yayılmadığı dövrdə aşıqlarımızı, onların yaradıcılığını xalqa məhz yazılı mətbuat çatdırıb. Qəzetlər ustad aşıqların irsini, mahir saz-söz sənətkarlarını təbliğ edib, ictimaiyyəti bu sahədəki vəziyyət, yeniliklər barədə məlumatlandırıb. Buna görə ümumən milli mətbuatımıza minnətdarlıq düşür. Ancaq indiki mərhələdə mətbuatın aşıq sənətinə diqqətinin zəifləməsi, sazın qəzet səhifələrində az təbliğ olunması da, çox təəssüf ki, günümüzün acı və arzuolunmaz reallığıdır. Ürəyimdən keçən budur ki, media aləmində xüsusi yeri olan yazılı mətbuatımız, nüfuzlu qəzetlərimiz aşıq yaradıcılığına diqqəti artırsın. Çox istərdim ki, saz sənəti qəzet jurnalistlərinin də müntəzəm şəkildə maraqlandıqları, izlədikləri və işıqlandırdıqları sahələr sırasında öz layiqli yerini tutsun.

**Müsahibəni apardı:**
**Sevinc MÜRVƏTQIZI**

**TƏBRİK EDİRİK!**

## AŞIQ İSFƏNDİYAR RÜSTƏMOV – 75



**Hörmətli Aşıq İsfəndiyar Rüstəmov!**

**Sizin çox maraqlı sənətkar taleyiniz vardır. Arxada qoyduğunuz bu 75 ildə özünüzdən əvvəlki ustadlara, sazımıza layiq olan bir ömür yaşamış, kamil ustadlardan dərs alaraq Azərbaycanda adı həmişə hörmətlə çəkilən aşıqlar sırasında dayanmısınız.**

**Müasir dövrümüzdə Azərbaycan aşıq sənətinin layiqli davamçılarından olan ustad aşıq kimi şərəfli bir ömür yolu keçərək ömrünüzün 60 ilə yaxınını bu sənətə həsr etmisiniz. Uzun müddət Gədəbəy rayonunda fəaliyyət göstərən aşıqlar ansamblına rəhbərlik edib, onlarla şəyird yetişdirmisiniz. Gədəbəy rayonunda aşıq sənətinin inkişafında, gənclərdə bu sənətə meylin artmasında Sizin böyük xidmətləriniz var. Ustad aşıq kimi şöhrətiniz Azərbaycanın hüdudlarını**

**çoxdan aşıb. İndi sizi təkcə Azərbaycanda yox, Türkiyədə, Cənubi Azərbaycanda, Gürcüstanda və digər ölkələrdə də tanıyır və sevirlər.**

**Sənətdə ilk uğurunuz 1958-ci ildə Bakıda keçirilən festivalda 1-ci dərəcəli diplom və döş nişanına layiq görülməyiniz olub və sonralar bu uğurlar, mükafatlar bir-birini əvəzləyib. 1972-ci ildə böyük ustad Aşıq Ələsgərin Moskvada qeyd olunan 150 illik yubileyindəki əvəzsiz çıxışınız isə Sizin şöhrətinizi daha da artırıb.**

**Ustad sənətkar kimi hər yerdə el məhəbbəti qazanmısınız, aşıq sənəti qarşısındakı xidmətləriniz dövlətimiz tərəfindən də yüksək qiymətləndirilib. 1991-ci ildə "Azərbaycanın Əməkdar mədəniyyət işçisi" fəxri adına, 2007-ci ildə isə Prezident təqaüdünə layiq görülmüsünüz.**

**Siz sazımızı yaşadan, keçdiyi həyat və yaradıcılıq yolu bu gün sənətə gəlmək istəyən cavanlara örnək olan, gənclik təravətini, səliqə-sahmanını qoruya-qoruya püxtələşib müdrikləşən sənətkarlarımızdansınız.**

**Sizi – Azərbaycan aşıq sənətinin layiqli nümayəndəsini anadan olmağınızın 75 illik yubileyi münasibəti ilə Azərbaycan Aşıqlar Birliyi və şəxsən öz adımdan təbrik edir, sağlam və gümrah olmağınızı, bundan sonra da bir ustad aşıq kimi ozan-aşıq sənətinə yeni-yeni töhfələr verməyinizi arzulayıram!**

**Zəlimxan YAQUB,**
Xalq şairi,
Azərbaycan Aşıqlar Birliyinin sədri.
Bakı, 24 avqust 2012-ci il.

# AŞIQ İSFƏNDİYAR RÜSTƏMOVUN 75 İLLİK YUBİLEYİ GƏDƏBƏYDƏ QEYD OLUNDU

2012-ci il avqustun 25-də Gədəbəy rayon Mədəniyyət evində Azərbaycanın Əməkdar mədəniyyət işçisi, Prezident təqaüdçüsü ustad aşıq **İsfəndiyar Rüstəmovun** anadan olmasının 75 illik yubileyi qeyd olundu. Filologiya elmləri doktoru, professor **Məhərrəm Qasımlının** apardığı tədbirdə Gədəbəy rayon ictimaiyyəti ilə yanaşı, respublikamızın digər bölgələrindən və Cənubi Azərbaycandan gəlmiş qonaqlar da iştirak edirdi. Gədəbəy rayon icra Hakimiyyətinin başçısı **Ramiz Yediyarov,** AMEA-nın Folklor İnstitutunun direktoru, professor **Muxtar İmanov,** Mədəniyyət və Turizm nazirliyinin əməkdaşı **Oqtay Muxtarov**, şairlər **İlyas Tapdıq** və **Dəmir Gədəbəyli,** filologiya üzrə fəlsəfə doktoru **Elxan Məmmədli**, Prezident təqaüdçüsü, ustad aşıq **Mahmud Məmmədov** və digərləri çıxış edərək ustad aşığın keçdiyi yaradıcılıq yolundan danışdılar, bundan sonra da aşıq sənətinin inkişafı naminə yorulmaz fəaliyyətində ona uğurlar arzuladılar.

Azərbaycan Aşıqlar Birliyinin katibi, "Ozan dünyası" jurnalının baş redaktoru **Musa Nəbioğlu** ustad aşığa AAB-nin sədri, Xalq şairi **Zəlimxan Yaqubun** təbrikini çatdırdı və Birliyin təbrik məktubunu oxudu, yubilyara qiymətli hədiyyə təqdim etdi. O, eyni zamanda bildirdi ki, AAB-nin və Mədəniyyət və Turizm nazirliyinin birgə təşkilatçılığı ilə İsfəndiyar Rüstəmovun yubileyi ilin sonunadək Bakı şəhərində də qeyd olunacaqdır.

İsfəndiyar Rüstəmovun yetirmələri və digər sənət dostları da bənzərsiz ifaları ilə ustada öz təbriklərini çatdırdılar.

**Ülviyyə Axundova**



**Qənirə PAŞAYEVA**
**Millət vəkili**



# BÜLBÜL KİMİ GÜL AŞİQİ

Dərin bir ümmana bənzəyən Azərbaycan xalq şeirinin geniş qollarından birini aşıqlar, digərini el şairləri yaratmışlar. Qoşma, gəraylı, təcnis, müxəmməs, divani, qıfılbənd, tərkibbənd, deyişmə və s. kimi ortaq şeir formalarından ibarət olan bu şeirin hər yarpağı xalqın zəngin bədii təfəkküründən qidalanır. Bu təfəkkür ədəbiyyatımıza Haqdan ilham butası alan Sarı Aşıq, Abbas Tufarqanlı, Qurbani, Xəstə Qasım, Aşıq Alı, Aşıq Ələsgər, Hüseyn Bozalqanlı, Aşıq Şəmşir, Azaflı Mikayıl kimi qüdrətli yaradıcı aşıqlarla bərabər Vidadi, Növrəs İman, Xəyyat Mirzə, şair Nəcəf, şair Vəli, İsmayıl Sadıxlı kimi gözəl el şairləri bəxş etmişdir.

Azərbaycan el şairlərinin görkəmli nümayəndələrindən biri də ötən əsrdə yaşayıb-yaratmış Həsən Mülkülüdür.

Hüseynov Həsən Hüseyn oğlu 1904-cü ildə Tovuz rayonunun Aşağı Mülkülü kəndində zəhmətkeş bir ailədə dünyaya göz açıb. Onun atası Hüseyn kişi sadə kəndli olsa da, söz xiridarı idi. Babası Nəcəf, əmisi Məmmədcəfər isə el-obada aşıq kimi tanınırdı. Güzəranın ağırlığı üzündən məktəb təhsili görməyən, oxuyub-yazmağı öz gücünə öyrənən Həsənin sözlə ilk ülfəti də ailə mühitində yaranır.

Toylarda, el şənliklərində Aşıq Hüseyn Bozalqanlı, Aşıq Mirzə, Aşıq Əsəd kimi aşıqlardan məşhur xalq dastanlarını, şeir incilərini eşitdikcə bu mehr-məhəbbət güclənərək onu da öz cazibəsinə alır. Tanrının lütfü olan fitri hafizə və yaddaş sayəsində Abbas Tufarqanlının, Qurbaninin, Xəstə Qasımın, Xəyyat Mirzənin, Aşıq Alının, Aşıq Ələsgərin qoşqularını içinə hopdura-hopdura özü də bədahətən şeirlər deməyə başlayır. Lakin saz havasına ipə-sapa düzdüyü qoşquların həqiqi şeir olub-olmadığını bir

zamanacan bilmir. Həyətdəki çardağın altında saza könlünü açdığı günlərin birində xəlvətcə oğlunun şeirlərini dinləyib məzmununa, vəzn və ahənginə fikir verən Hüseyn kişi oğlana yaxınlaşır. Həsən utanıb sazı sinəsindən endirmək istəyəndə qoymur:

– Utanma, oğlum, qoşqularının mətləbi, düzgüsü, havacatı yerli-yerindədir. Sazını götür, oxu, səni bir də yaxından dinləyim. Həsən sıxıla-sıxıla "Şərili" havası üstündə bir müxəmməs oxuyur:

*Qulaq as, bir sözüm var,*
*Deyim dərdim sana, gözəl.*
*Dönübdür sinəm evi,*
*Zəmbur salan aşana, gözəl.*
*Könlümün taxtı inan,*
*Çevrilibdir yana, gözəl.*
*Qulunam, əsirinəm,*
*Deyirəm mərdana, gözəl.*
*Eyləyərmi insan olan,*
*Bu zülmü insana, gözəl?*
*Rəhm eylə mən fəqirə,*
*Qataq canı-cana, gözəl...*

Huş-guşla dinləyən Hüseyn kişi müxəmməs bitəndə "ustad oğlundan şəyird olmaz, sən anadangəlmə şairsən" – deyərək, oğlunun alnından öpüb xeyir-dua verir. O gündən özünə Mülkülü Həsən təxəllüsü götürən el şairinin ürəklərə yol tapan, könülləri oxşayan gözəl şeirləri sinəsindən bulaq kimi çağlayır.

Sələfləri kimi, Həsən Mülkülünün də birinci ilham pərisi gözəllik idi. Onun aşiqliyi "mina gərdənli, qarğı saçlı türfə gözəllərə" və yar sevdasından gəlirdi:

*Bütün bu dünyaya gələn aşıqlar,*
*Çalıb oxudular, yar, aman-aman.*
*Eşqin atəşindən, qəm hicranından,*
*Yandırdı sinəmi nar, aman-aman.*

Müdrik el şairində aşiqliklə bərabər, dünyanın sirrinə, əvvəlinə-axırına vaqiflik də var idi. Odur ki, yar sevdasıyla söylədiyi qoşqusunu dünyanın faniliyi, zövq-səfanın ötəri olması haqqında müdrik bir qənaətlə bitirirdi:

*İstər ağlayasan, istər güləsən,*
*Yaşayasan yetmiş, səksən ilə sən.*
*Axırın ölümdü, yəqin biləsən,*
*Kömək durmaz, qohum, var, aman-aman.*



Amma amansız tale onu öz axırından əvvəl doğmalarının axırıyla üzləşdirdi. Əvvəlcə istəkli ömür-gün yoldaşı Məleykə xanımı itirdi, sonra da oğlu Əzizin qəzası özünü yetirdi. El-obada Şair Məftun kimi məşhurlaşan Əziz Leyla adlı bir qıza dəlicəsinə aşiq olaraq divanəyə çevrildi. Təbiblərin dərdinə dərman tapa bilmədiyi zəmanə Məcnunu 42 yaşında yar deyə-deyə dünyadan köçdü. Yarını və ciyərparasını itirəndən sonra dövrünün ən nikbin el şairlərindən olan Həsən Mülkülünün ürəyini qubar basdı. Çalın-çarpaz dağlardan sonra eşq kəlməsiylə dərd-qəm kəlməsi dilində qoşa bitdi:

*Oğul, xəbər alsan kim olmağımı,*
*Fələyin qəhrini çəkənlərdənəm.*
*Qoşub süysününə qəm kotanını,*
*Özünə dərd, azar əkənlərdənəm.*

Əziz Məftunun ölümü yalnız bir övlad itkisi deyildi. Yar sevdasıyla ilham pərisi qoşa doğulan Məftun gözəl bir şair idi və Həsən Mülkülü onu itirməklə həm də söz-fikir həmdəmini itirmişdi. Odur ki, həmdəmini tanıtmaq borcunu da boynuna götürmüşdü və onu belə tanıdırdı:

*Anadan olanda bədbəxt yarandı,*
*Leyli, Leyli deyib ağladı Məftun.*
*Barmaq qələm oldu, köynəyi kağız,*
*Qanıyla dastanlar bağladı Məftun.*

Onu da demək istəyirik ki, bu qəmli notları şairin bioqrafiyası və şəxsi həyatı ilə bağlı olduğu üçün misal gətirdik. Amma görkəmli el sənətkarı dərindən böyük adam idi. Yaşadığı faciələrə baxmayaraq, həmişə nikbinliyini qoruyub saxlamış, bir gözü gülüb, bir gözü ağlayaraq Vətəninə, xalqına ürəkdən nəğmələr qoşmuş, onu tərənnüm etməkdən nə yorulmuş, nə də doymuşdur:

*Odlar diyarının, Azərbaycanın,*
*Payızı gözəldir, yazı gözəldir.*
*Düşən məclislərdə meydan sulayan,*
*Aşığın söhbəti, sazı gözəldir.*

*Dolanıb gəlmişəm aranı, dağı,*
*Olmuşam dostların əziz qonağı.*
*Behiştə bənzəyir Kürün qırağı,*
*Dərəsi, təpəsi, düzü gözəldir.*

Xalq şeirinin əksər formalarında yazıb-yaradan şairin külli miqdarda qoşma, gəraylı, təcnis, dodaqdəyməz təcnis, qıfılbənd, deyişmə və müxəmməsləri vardır. Həmin şeirlərin bir çoxu aşıqların dilinin əzbərinə çevrilərək toylarda, şənliklərdə oxunmaqla yanaşı, mətbuatın qıt və tələbkar vaxtında almanaxlarda, aşıq kitablarında və "Ulduz", "Azərbaycan", "Kənd həyatı", "Ədəbiyyat və incəsənət", "Azərbaycan gəncləri", "Bakı" kimi müxtəlif mətbuat orqanlarında dərc olunaraq xalqın malına çevrilmişdir.

Həsən Mülkülü təkcə sözüylə deyil, şəxsiyyəti ilə də xalq arasında sayılıb seçilirdi. Uzun müddət müxtəlif vəzifələrdə çalışması, ictimai işlərdə fəallığı və camaatla mehriban ünsiyyəti ilə böyük hörmətə, nüfuza çatmışdı. Bütövlüyü, duz-çörəyə, əhd-peymana sadiqliyi, hər kəsin və hər sözün çəkisini bilməsiylə Azərbaycanın bir çox görkəmli qələm adamlarının da məhəbbətini qazanmışdır. Hələ gənclik çağlarında Səməd Vurğun, Osman Sarıvəlli, Hüseyn Bozalqanlı kimi böyük sənətkarlarla qurduğu dostluq körpüləri sonralar Xəlil Rza Ulutürk, Tofiq Bayram, Nəriman Həsənzadə, Hüseyn Arif, Zəlimxan Yaqubla daha da genişlənib möhkəmlənmişdir. Səməd Vurğun el sənətkarı üçün həm də uca bir örnək idi və onun yaradıcılığında Vurğunun xalq ruhlu şeirlərinin təsiri duyulurdu. Özünə ustad bildiyi böyük şair Moskvada ağır xəstə yatanda ona narahatlıq dolu bir şeir də yazmışdır:

*Bütün şairlərin pəriskarıdır,*
*Hər kəlməsi-sözü dürr, mirvaridir.*
*Vidadi, Vaqifin yadigarıdır,*
*Həmişə sağ görüm dəstə Vurğunu.*

Bir əsrə yaxın ömür yolu və zəngin yaradıcılıq. Həsən Mülkülünün dünyadan qazancı yalnız bunlar deyildi. Onun bir qazancı da nəslinin, şəcərəsinin davamı, kök üstündə yeni budaqların pöhrələməsiydi. Başqa bütün övladlarını araya-ərsəyə çatdırmış, nəvə-nəticə sahibi olmuşdu. Və həmin nəvələr ona "atdı baba" deyirdilər. Bunun da öz tarixçəsi vardı. Həsən kişi özünü tanıyandan at üstündə olmuşdu. Hətta maşın çıxandan bir müddət sonra da kəndin işlərini yola vermək üçün rayona, ya bir yerə gedəndə atla gedərdi. Camaat hündür boylu, enli kürəkli, şax qamətli bu saytal kişini həmişə atın belində gördüyündən ona "atdı Həsən" deyirdi. Sonra həmin söz balacaların dilinə keçib oldu "atdı baba". Amma "atdı baba"nın da atdan düşən vaxtı yetişdi və bunu fəhmlə özü də duyduğundan son şeirlərindən birində dostdan, qohum-qardaşdan halallığını belə istədi:

*Dostlar, gəlin vidalaşaq,*
*Daha sizdən ayrılıram.*
*Gəlinlərdən, nəvələrdən,*
*Oğul-qızdan ayrılıram.*

*Ay qabaqlı qələm qaşdan,*
*Mina gərdan, qarğı saçdan,*
*Tər cığalı yaşılbaşdan,*
*Şəhla gözdən ayrılıram.*

*Şair Həsən el aşiqi,*
*Bülbül kimi gül aşiqi.*
*Məclislərin yaraşığı,*
*Sazdan-sözdən ayrılıram.*

Qocaman el sənətkarı 1994-cü il aprel ayının 6-da dünyasını dəyişib, Aşağı Mülkülü kənd qəbiristanlığına – ömür-gün yoldaşı Məleykə xanımın və nakam oğlu şair Əziz Məftunun yanına köçdü. Qəbri nurla dolsun!

Həsən MÜLKÜLÜ

## DÜNYA

*Oxumuşam tarixləri,*
*Bəlli deyil yaşın, dünya.*
*Bahar vaxtı üzə gülər,*
*Qan ağlayır qışın, dünya.*

*Gah tikənsən, gah quran sən,*
*Bir tərəfdən uçuransan.*
*Yaranmışı tez qıransan,*
*Budur sənin işin, dünya.*

*Nə qartalıb qocalansan,*
*Nə alçalıb ucalansan.*
*Padşahlar taxtdan salansan,*
*Yox heç kəslə xoşun, dünya.*

*Dayanıbsan, keçən döysən,*
*Yaxşı-yaman seçən döysən.*
*Gələndə, heç keçən döysən,*
*Olsa da qardaşın, dünya.*

*Yazıq Həsən yenə yandı,*
*Həyat sonsuz bir virandı.*
*Bir sən ilə yaşayandı,*
*Torpağınla daşın, dünya.*

## MƏNİ

*Əyrilərə yoldaş oldum,*
*Danammadı düzlər məni.*
*Gəlinlərə dastan yazdım,*
*Tənqid etdi qızlar məni.*

*Aşıq çal... "Dilqəm", "Kərəm"i,*
*Bundan gözəl mənzərəmi?*
*Qurtarar dərdi-vərəmi,*
*Təbib versə, düz dərmanı.*

*Səndən uzaq olsa aram,*
*Yenə sənə vəfadaram.*
*Sağalarmı sənsiz yaram,*
*Yıxşırsalar yüz dərmanı.*

*Şair, gördün ülvi-gözəl,*
*Xəyyat kimi ölç-biç əzəl.*
*Yaratmışam şeir-qəzəl,*
*Yaşadacaq sözlər məni.*

*Həsən gəzdi hər mahalı,*
*Sevib-seçdi qara xalı.*
*Dodaqların beçə balı,*
*Yanaqların göz dərmanı.*

## MƏN

*Yaradanım nicat versə,*
*Hələ nələr qoşaram mən.*
*Bulaq kimi qaynayaram,*
*Çaylar kimi daşaram mən.*

*Hərdən sazı alam ələ,*
*Sözüm düşər dildən-dilə.*
*Bəxt oyanar, yığval gələr,*
*Ürəklərdə yaşaram mən.*

*Həsən gəzdi hər diyarı,*
*Sədaqəti, etibarı.*
*El unutmaz sənətkarı,*
*Hər gün yada düşərəm mən.*

## OĞUL

*Mən çox dedim, az eşitdin,*
*Sən düşmədin başa, oğul.*
*Ürəyimdən qanlar axdı,*
*Bax gözümdə yaşa, oğul.*

*Bil, nə çəkir ata, ana,*
*Olublar sənə pərvanə.*
*Ya bir sərxoş, ya divanə,*
*Heç gələrmi xoşa, oğul.*

*Həsənəm, oda yanmışam,*
*Qaralara boyanmışam.*
*Heykəl kimi dayanmışam,*
*Dönmüşəm bir daşa, oğul.*

## DOLANDIĞIM

*Bir ərzim var, qəbul eylə,*
*Yar, başına dolandığım.*
*Bəsləyibsən ağ sinəndə,*
*Nar, başına dolandığım.*

*Dərdin alım, etmə inad,*
*Gəl könlümlə ülfəti qat.*
*Ləblərində abi-həyat,*
*Var, başına dolandığım.*

*Çox demişəm dönə-dönə,*
*Yalvarıram sənə yenə.*
*Bir busə şair Həsənə,*
*Ver, başına dolandığım.*

## OLSUN

*Saxlayanda köhlən saxla,*
*Qoy mənzilə çatan olsun.*
*Dəryalardan ləl, gövhər yığ,*
*Xirdarına satan olsun.*

*Nə səhv olsun, nə aldanış,*
*Nə sən utan, nə dost-tanış.*
*Danışanda düzgün danış,*
*Beyinlərə batan olsun.*

*Yazan vaxtı pilə yaz ki,*
*Hamı qəlbin bilə, yaz ki,*
*Həsən, şeiri elə yaz ki,*
*Ürəklərə yatan olsun.*



**Mirzə MƏMMƏDOĞLU**



# QƏDİM TİFLİS XANƏNDƏLƏRİ

XIX əsrin əvvəllərində Rusiya imperiyasının Qafqaz canişinliyi Tiflisdə yerləşdiyindən burada ədəbi mühit də daha da təşəkkül tapmağa başlamışdır. Buradakı ədəbi mühit Azərbaycanın görkəmli ədiblərini, musiqiçilərini, xanəndələrini və sənət adamlarını özünə cəlb etmişdir. Onlar Tiflisdə yaşayıb yaratmışlar.

Gürcü xalq mahnılarının tədqiqatçısı M.M.İppolitov-İvanov yazır:

«Xanəndə və çalğıçılara o zaman «sazəndə dəstəsi» deyirdilər. Bütün xalq şənliklərinə sazəndə dəstəsi dəvət olunardı».

XIX əsrin ikinci yarısında sazəndə dəstəsi – xanəndə, tarzən, kamança və qoşa nağara çalanlar olmaqla dörd nəfərdən, XIX əsrin əvvəllərindən isə xanəndə dəstəsi əsasən üç nəfərdən – xanəndədən, tarzəndən və kamança çalandan ibarət olmuşdur.

Xalq yazıçısı, akademik M.İbrahimov klassik xanəndələrimizin adət-ənənələrindən və onların sənətə münasibətlərindən bəhs edərək yazırdı:

«Keçmişdə əsl xanəndə və çalğıçıların möhkəm ədəb-ərkan qaydaları vardı. Onlar geyimlərinin səliqəsinə, zahiri hərəkətlərinin nəcibliyinə, ağır oturub, ağır durmağa fikir verdikləri kimi, ifaçılıqda da müəyyən kamil, bütöv qaydaları gözləyirdilər. Xüsusən oxunan havaların bitkinliyinə çalışar, sözlərini diqqətlə seçər, əxlaqi, fəlsəfi və estetik mənası olan qəzəllər, bayatılar, qoşmalar, gözəlləmələr oxuyardılar».

Xanəndələrin tərkibi eyni deyildi. Saray xanəndələrindən, yəni varlılara xidmət edən müğənnilərdən başqa gəzərgi xanəndələr də var idi. Tiflisin iri küçələrində, bağlarında, bazar və ticarət meydançalarında, şəhər sənətkarlarının və xırda tacirlərinin məclislərində çalıb-oxuyardılar.

Azərbaycanın müxtəlif şəhərlərində olduğu kimi, «Şərq gecələri» Tiflisdə də keçirilirdi. Əvvəllər musiqili səhnəciklər, teatr tamaşaları və rəqslərdən tərtib edilirdisə, XX əsrin iyirminci illərindən etibarən gecələr müəyyən bir sənətkarın yaradıcılığına həsr olunurdu.

Görkəmli rus tarixçisi A.Kişmişov yazır:

«O dövrdə əhalinin əksəriyyəti «köhnə şəhər»də yaşayırdı. Gün çıxandan gün batana kimi onun küçələrində həyat qaynayırdı. Erməni

bazarında, tatar (Azərbaycan - M.M.) bəzzazxanasında, Sion küçəsində və bura yaxın olan karvansarada xüsusi canlanma gözə çarpırdı. Şəhərin bu gur yerlərində böyük kommersiya və parça alveri aparılırdı.

Küçələrdən gediş-gəliş kəsilmirdi. Axşam düşən kimi mahnı sədaları şəhəri bürüyürdü. Açıq havadakı bu konsertlər yerli əhalinin musiqi qabiliyyətini açıq-aydın göstərirdi. Bu mahnıların yaradıcıları ölməz xalq xanəndələri idi. Onlar aylı gecələrdə şəhərin meydançalarına toplanıb son dərəcə melodik alət olan tarın müşayiətilə xalq nəğmələri oxuyurdular.

Xanəndələr küçələrdə görünən kimi şəhər əhli evlərin eyvanına, damına və darvazaların ağzına toplaşıb, gecəyarısına qədər davam edən musiqi nəşəsindən həzz alardılar. Yerli musiqiçilərin mahnılarının sədası altında şənlik səhərə qədər davam edirdi. Dan qızaranda hamı evlərinə çəkilərdi. Bəziləri isə elə oradaca yatardılar ki, sabahı günü yenə musiqi ilə əylənsinlər.

Qədim Tiflisə yaxşı bələd olan şair-akademik İosif Qrişaşvili burada yaşayıb yaradan sazəndələrdən yazarkən Mirzəcan, Hacı Yusif, Məşədi İsi, David bəy (Tarzən), Abdülbaqi (Bülbülağa), Dilmanlı Həsən, Zülal, Həsənçə, Həşim (Keştazlı - M.M.), Ağacan, Şöhliyyə, Allahverdi, Səttar, Cəfər və başqalarının adını çəkir.

O dövrdə Tiflisin ən yaxşı xanəndəsi Allahverdi olub. Onu da qeyd etmək lazımdır ki, Azərbaycan musiqisinin tədqiqatçısı Firidun Şuşinskinin yazdığına görə, o, Nəriman Nərimanovun ulu babası olub.

Salnaməçi yazır: «Allahverdi bir an da olsun belə çar İraklidən uzaq düşmürdü, fədakarcasına vuruşurdu. («Saliteraturi nadzilni» 1832-ci il №4)

Çar İraklinin dəfn mərasimində sevimli xanəndə təmtəraqla iştirak etmişdir. O, çar İraklinin tabutunu yonub düzəltmişdir. Şahzadə Dmitri özünün şeirlərinin birində Qoca babanın vəfatını və dəfnini tam təfsilatı ilə qələmə alır və Allahverdi barəsində söhbət açır.

Çar İraklinin ölümündən sonra Allahverdi saraya gedib-gəlməyi yenə də davam etdirmişdir. Allahverdinin ən çox şahzadə Aleksandr ilə yaxşı münasibəti var idi. Aleksandr Allahverdisiz süfrə arxasında oturmazdı. Şulaverdə təşkil etdiyi ziyafətə Allahverdini də özü ilə aparmışdı.

Şahzadə İohane «Kalmasoba» əsərində məlumat verir: «Şahzadə Aleksandr məclis əhlinin hamısını ziyafətə dəvət etdi. Və əmr etdi ki, xanəndə Allahverdi bura təşrif buyursun. O da gəldi, həvəslə çalıb-oxumağa başladı.»

Allahverdi salamurda da, çonqurda da, tarda da əla çalır, Aleksandr Çavçavadzenin və başqalarının şeirləri üstündə mahnılar ifa edirdi.

Ketevan Orbeliani qeyd edir: «Aleksandr Çavçavadzenin şeirləri üstündə tatar (azərbaycanlı - M.M.) Allahverdi oxuyurdu və

Çavçavadzenin evinə gedib-gəlirdi. («Literaturis matiane» jurnalı, 1990-cı il, №1-2, səh. 212)

«Qarasaqqallı xanəndə zahiri görünüşünə görə həddindən artıq yaraşıqlı və gözəl idi.» (yenə həmin mənbədə)

«Baqratı Peterburqa aparanda onu orada Zaza Andronikov qarşılayır. O, şahzadə Mariyamın qızı Anastasiyaya nişanlı idi. Zaza Peterburqda yepiskop Dosieto ilə çimməyə gedir. Zaza suda boğulur.

Bu gənc Anastasiya ilə duz-çörək kəsibmiş. Bu hadisə onu çox bikef edir, kədərləndirir. Bu zaman xanəndə Allahverdini gətirirlər. O, xanəndəni mahnı oxuyan zaman görəndə ona vurulur. Allahverdi bu qızı götürüb qaçırdır və hamam yaxınlığındakı evinə aparır. Katalikos qızı geri gətirdir və Allahverdini təqib etməyə başlayır. Həmin tatar (azərbaycanlı - M.M.) kükürdlü hamam yaxınlığındakı mağaraya girir. Bütün şəhər onun zəngulələi səsini eşitməyə axışırdı. Anastasiya öləndə o, salamurunu qırmış və tarı əlinə götürmüşdür. Bundan sonra o bir daha evlənməmişdir. (Qriqol Orbeliani «Şeirləri», 1935, səh. 46)

Qriqol Orbeliani şeirlərinin birində Allahverdi barəsində yazır:

*«Mənəviyyatca bir olub bura yığışanlar,*
*Tarla, badə ilə, buynuzla, azərkeşlərinizlə*
*Şərab süfrəsini gül-çiçəklə bəzəyin,*
*Allahverdini də öz tərifli tarı ilə oturdun.»*
(sətri tərcümə)

O vaxtlar Tiflisdə yüksək vəzifəli şəxslər, knyaz və aznaurlar arasında zurnaçılardan çox xanəndələrə üstünlük verilirdi. Xanəndələr kvartetdən və yaxud dörd nəfər musiqiçidən ibarət idi. Dəf çalan xanəndə, tar çalan, çianur çalan və nağara çalan. Bu simli iki musiqi aləti – tar və çianur xalq çalğı alətləri arasında özünün tembri və böyük diapazonuna görə ən zəngin alət hesab olunurdu.

O dövrün məşhur xanəndələrindən biri də Səttar olub.

Aleksandr Barnov «Köhnə Tiflisin musiqiçiləri» kitabında yazır: «Səttar əslən İran Azərbaycanından idi. O, Ərdəbildə XIX əsrin 20-ci illərində anadan olmuşdur. Səttar elə uşaqlıq vaxtlarından musiqiyə meyl göstərmişdir. Parlaq istedada və şirin ləhcəyə malik olub. O, əvvəlcə dinə qulluq etməyə başlayır. Lakin onu axıra kimi davam etdirmir. İki-üç ildən sonra dindən uzaqlaşır. Şənliklərdə və toylarda muğam və xalq mahnılarını ifa etməyə başlayır. Səttar Şərqin görkəmli klassik şairlərindən Sədi, Hafiz, Füzuli və başqalarının qəzəlləri üstündə muğamları və təsnifləri çox ustalıqla ifa edir. Səttarın şan-şöhrəti tezliklə

şah Məhəmməd Mirzənin qulağına çatır. Şah Səttarı öz sarayına dəvət edir. O, burada bir neçə il qalır.

19-20 yaşlarında Səttar Tiflisə gəlir. Özünün valehedici səsi ilə qısa müddət ərzində tiflislilərin diqqətini özünə cəlb edir. Mahnı oxuyan zaman o, sən demə, dəfdən istifadə etmirmiş. Öz dəstəsi ilə oturub əlində əsa mahnını elə şirinliklə ifa edirmiş ki, dinləyicilər ovsunlanırmış».

Nikoloz Barataşvili Səttarla görüşüb onu tez-tez şənliklərə aparardı. Azərbaycanın böyük musiqişünası Firidun Şuşinski öz məqaləsində Səttara yüksək qiymət verir: «Səttarın Qafqaz xalqlarının milli musiqisinin inkişafında böyük rolu vardır. Səttarın konsertlərində Tiflisdə yaşayan rus və italyan musiqi həvəskarları iştirak edir və özlərinin konsertlərində iştirak etmək üçün onu da dəvət edirdilər. 1847-ci ildə italyan skripkaçı Tiflis teatr orkestrinin dirijoru Malaqolli Səttarı xeyriyyə cəmiyyəti tərəfindən təşkil olunmuş konsertdə iştirak etməyə dəvət etmişdi. Konsertdə muğam oxuyan Səttar böyük müvəffəqiyyətlər qazanmışdır» (Firidun Şuşinski. «Sovet incəsənəti» jurnalı, 1968-ci il, №2, səh. 61).

Bir çox tarixi məxəzlərdən məlum olur ki, Səttar Tiflisin musiqi həyatında görkəmli rol oynamışdır. O, nəinki musiqi gecələrində, həm də açıq havada təşkil olunan konsertlərdə və ziyafətlərdə məlahətli səsi ilə çoxmillətli şəhərin sakinlərinə estetik zövq vermişdir.

O zaman şəhər tacirləri növbə ilə qonaqlıqlar verərdilər ki, bunu da ki, «Riqis puri» («Növbəti nahar») adlandırırdılar. Bu qonaqlıqlar qışda evlərdə, yay aylarında isə bağlarda təşkil olunardı. Belə qonaqlıqlarda başqa xanəndələr kimi, çox vaxt Səttar da iştirak edərdi.

Səttar Tiflisdə yaşadığı illərdə onu nəinki xalq şənliklərinə, hətta Qafqaz canişininin iqamətgahında İran şahlarının, Türkiyə sultanlarının və digər rəsmi şəxslərin şərəfinə verilən ziyafətlərinə də dəvət olunardı.

Azərbaycan xanəndəsi həmişə çoxmilləti ictimaiyyət qarşısında çıxış etmiş və dinləyiciləri heyran qoymuşdur.

Səttar xeyriyyə konsertində dəfələrlə çıxış etmiş, o cümlədən yoxsullara kömək məqsədi ilə keçirilən beynəlxalq konsertlərdə skripkaçı Miller ilə, müğənni Seymur-Şiff ilə birgə iştirak etmişdir.

Səttar o dövrün ən sevimli xanəndəsi idi. Şərq havalarını əvəzsiz ifa edən Səttar özünün diqqətəlayiq tenoru ilə dinləyiciləri ovsunlayırdı (Nikoloz Barataşvili. Seçilmiş əsərləri, 1939-cu il, səh. 29). Nikoloz Barataşvili Səttara heyran olmuşdu. Onsuz bir məclisə getməzdi. Şairin bibisi Barbara Vezirişvili məlumat verir: «Niko hər şadyanalıqda Səttarı da gətirdərdi».

Səttar Barataşvilinin bacısı Yekaterinanın toyunda onunla bərabər olub. Nikoloz Barataşvili Z.Orbelianiyə yazdığı məktubunda Ksan dərə-

sinə (Axalqoriyə) gedişini, oradakı ziyafəti və Səttarın iştirakını belə qələmə alır: «Axalqoriyə daxil olduq. Saray başdan-başa çılçıraq içində idi. Zurnaçılar çalırdı. Səttarın mahnısı da onu müşayiət edirdi. Tüfəng atəşi, camaatın qalabalığı, hay-küyü, gözəl bir aləm idi».

Nikoloz Barataşvili Kartlidə olarkən kilsənin qapısında yazdığı şeiri Səttara həsr etmişdir. İ.Meunargiya məlumat verir: «Səttar o dövrün birinci xanəndəsi idi. Barataşvili onun əsl azərkeşi idi. Dmitri Vezirişvilidən eşitmişəm ki, şair Kartlidə hardasa kilsənin qapısında bu xanəndəni tərif etmişdir.

19-cu əsrin birinci yarısında Qafqaza sürgün edilmiş dekabrist – şair Yakov Polonski o dövrün məşhur Azərbaycan xanəndəsi Səttara şeir həsr etmişdir.

## Səttar

*Səttar! Səttar! Nə yaman qəhərlidir ah-vayın,*
*O boğuq fəryadında göy kişnər, bulud ağlar.*
*Kamanın iniltisi, qavalın qəm harayı,*
*Sinəmə dağlar çəkər, qəlbimdə yuva bağlar.*
*Oxuduğum sözləri anlaya bilməyirəm,*
*Başqa ruhda köklənib əzəldən könül sazım,*
*Səninsə öz komandan hey ucalıb avazın.*
*Gecədir... Tiflis susur, mən səni dinləyirəm ,*
*Sanki şərqli qardaşım xəstə qəlbimi didir,*
*Sənin dilinlə məni danlayır, tənbeh edir...*
*Bilirəm nə deyirsən, nə danışır ilhamın,*
*Bəlkə qana qan deyə coşursan, çağlayırsan.*
*Bəlkə mədh eləyirsən qılıncını İslamın ,*
*Önündə zaman-zaman qullar əsən zamanlar...*
*Sözsüz, mənə aydın bu ahlar, bu amanlar!*

Bu şeir 1850-ci ildə Tiflisdə çıxan «Qafqaz» qəzetində dərc olunmuşdur. Tərcümə Vilayət Rüstəmzadənindir.

Qəzetin redaktoru O.Konstantinovun həmin şeirin altında Səttar haqqında qeydləri vardır. Həmin qeydlərdə oxuyuruq:

«Səttar Tiflisdə məşhur olan iranlı xanəndənin adıdır. Onu Asiya tərzində şənliklər edərkən nahar və şama dəvət edirlər. Səttardan başqa iki xanəndə də məşhurdur. Bunlardan biri İrəvan sakini Əli Əsgər, o birisi isə Yevanquldur. Bunların arasında həm rəqabət, həm də yarış vardır. Mən bunların üçünü də eşitmişəm. Birinciliyi isə Səttara verirəm. Onun səsindəki həzinlik və kədər motivləri avropalıların qəlbini titrətməklə ürəyində qəribə həyəcanlı hisslər yaradır».

Şamaxıda Mahmud ağanın məclislərinin birində Səttar oxuyarkən Seyid Əzim Şirvani onun səsinə valeh olaraq müxəmməslərinin birində onu belə tərif etmişdir:

*«Ud hər ləhzə gəlib şurə deyir: ya Məbud,*
*Tar hər ləhzə gəlib vəcdə deyər: ya Səttar».*

Məşhur fransız yazıçısı Jül Vern özünün «Arxipelaq alovlanır» əsərində Səttarın səsinə yüksək qiymət verərək yazırdı:

«Bu ləyaqətli patriarxın daha zildən oxumağını arzu edərək mən Kür çayının sağ sahili ilə yuxarı qalxmağa başladım ki, oradan dağın təpəsindən (Sənan dağından – M.M.) şəhərin gözəl mənzərəsinə tamaşa edim. Budur, dağın təpəsinə çatıram, kiçik bir meydançada dayanıram: burada kimsə, səyyar bir aktyor (Səttar – M.M.) böyük bir həyəcanla gözəl İran şairi Sədinin şeirlərini incə musiqi təranələrinin müşayiəti ilə oxuyur».

Tezliklə Tiflisdə Cəfər adlı yeni bir xanəndə meydana çıxdı. Şəhər iki hissəyə bölünmüşdü. Onun bir hissəsi Cəfərə üstünlük verirdi, o biri hissəsi isə Səttara. Nikoloz Barataşvili Səttarın tərəfində idi. Naxçıvandan şair Mayqo Orbelianiyə yazdığı məktubunda qeyd edirdi: «O Cəfəri təriflməklə zəhləmizi apardılar. Kimin kitabı əlimizə düşdüsə, hamısı ondan tərif yazırdı. Onun hal-qaziyəsini bizə belə söyləyiblər: Onu Süleyman xan İrandan gətirmişdi. İki gün iki gecə burada bizdə olublar. Nə bacarıqları varsa, onu göstəriblər. Kim deyir ki, Səttardan artıqdır. Görünür, yaxşı dinləmə qabiliyyəti yoxdur. Mən sizə deyəcəm. O, Səttardan daha çox savadlıdır. Lakin Səttara səsi Tanrı verib. Həm də əlavə edib ki, belə bir səs heç kimdə olmayacaqdır. Bir, hər ikisinə baxın. Biri insan oğludur, o birisi isə cəhənnəm odudur».

Barataşvilinin xatirələrindən məlum olur ki, o, Naxçıvanda ikən Şəki xanının oğlu Süleyman xan məşhur xanəndə Cəfərlə bərabər oraya gəlir. Qonaqlar iki gün, iki gecə Barataşvilinin mənzilində qalırlar. Xanəndə Cəfərin oxumağı Barataşviliyə çox ləzzət verir.

1844-cü ilin noyabrın sonlarında İlya Orbeliani Tiflisə Çavçavadzenin qızlarının qayıtması münasibəti ilə böyük ziyafət vermişdir. Səttar həmin ziyafətə dəvət olunmuşdur. Həmin il dekabrın 4-də Qriqol Orbeliani Cüngündən öz qardaşı Zaxara yazırdı: «Katinanın Minqreldən, Ninonun Odessadan gəlişini şəhər duydu. Beybutovun arvadı Mananın evlərində durub İlyanı dəvət etmiş və çox böyük məclis təşkil etmişdir. Zurnalı, çianurlu və ağa Səttarın iştirak etdiyi bir məclis qurmuşdu».

Müştəhid bağı açılanda Səttarın daha vaxtı yox idi. Kef çəkənlər bütün məclislərə onu aparırdılar. Qriqol Orbeliani Kaplan Orbelianiyə yazırdı: «Niko bütün bizim məhləni Müştəhid bağına dəvət etmişdir.

Musiqili, zurnalı ağa Səttar olan bir məclisə. Gecəyarı saat üçə qədər orada olduq».

Səttar kifayət qədər yaxşı improvizator idi. O, tamamilə sərbəst şəkildə gürcü dilində şeirlər yazırdı. 1857-ci il sentyabrın 14-də İvane Kereselidze Rafiel Eristaviyə məlumat verirdi: «Sənin «Nino»nu Tiflisdə çox bəyənirlər. Belə deyirlər ki, guya mərhum Arçil Muxranski barəsində yazılmışdır. Ah, Rafiel, bilirsən, Səttar onu necə sevirdi. Bir başa düşəsən. Bu yeni mahnını necə ifa edirdi!»

1860-cı il yanvarın 4-də Tiflisdə Səttarın benefisi təyin olunmuşdu. Həmin il yanvarın 3-də Qriqol Orbeliani Kaplan Orbelianiyə məlumat verirdi: «Sabah, yəni ki, bazar ertəsi teatrda ağa Səttarın benefisidir. Və bu biletlərdən nəyi oxuyacağını artıq bilirəm. Birbaşa gəl mənim lojama».

Xanəndə Səttar indiki Nəbatat bağında əvvəllər mövcud olan müsəlman qəbiristanlığında dəfn edilmişdir.

Səttar və Cəfərdən sonra Yevanqul adlı xanəndə meydana çıxdı. Əslən Şuşadan idi. O, Aleksandr Çavçavadze, Qriqol Orbeliani, Georgi Eristavi, Nikoloz Barataşvilinin və başqalarının şeirləri üstündə gürcü dilində də mahnılar ifa edirdi.

O zamanlar Tiflisdə göstərilən teatr tamaşalarının fasilələrində tarzən kimi çıxış edənlərdən biri də Sadıqcan idi. Şuşada anadan olan bu sənətkarın Azərbaycan musiqi mədəniyyəti tarixində müstəsna xidmətləri olmuşdur. 1886-cı il dekabrın 29-da Tiflisin «Artsruni» teatrının binasında M.F.Axundovun «Müsyo Jordan və dərviş Məstəli şah» komediyası tamaşaya qoyulmuşdur. Həmin tamaşanın afişasında fasilələrdə məşhur tarzən Sadığın çalacağı, xanəndə Mirzəlinin isə oxuyacağı qeyd edilmişdi.

Sadıqcan Tiflisin Müştəhid bağında dəfələrlə çıxış etmişdir.

Sadığın ustadı olmuş tarzən Mirzə Muxtar 1914-cü ildə Tiflisdə «Leyli və Məcnun», «Əsli və Kərəm» operalarında uğurla çıxış edərək tamaşaçıların rəğbətini qazanmışdır.

Tiflis şəhərində Sadıqcan ilə dəfələrlə verilən konsertlərdə, teatr tamaşalarının fasilələrində aşıq Abbasqulu da iştirak etmişdir.

O vaxtlar bir tarzən kimi Rzabala Rzayevi də yaxşı tanıyırdılar. Rzabala Rzayev Cabbar Qaryağdı oğlu ilə, Seyid Şuşinski ilə, Xan Şuşinski ilə, Məşədi Məmməd Fərzəliyev ilə və başqa xanəndələr ilə teatr tamaşalarının fasilələrində uğurla çıxış etmişdir. O, ən çox Seyid Şuşinski ilə bərabər konsertlərdə çıxış etmişdir. Rzabala Rzayev bir vaxtlar Şah Abbas məscidinin axundu, dövrün mütərəqqi şəxslərindən olan Məşədi İsmayılın oğludur. Rzabalanın yaşı 90-nı haqlamış oğlu, Böyük Vətən müharibəsi veteranı Nürəddin Rzayev hazırda ABŞ-ın Nyu-York şəhərində yaşayır. Onun oğlu İsmayıl Rzayev isə dövrümü-

zün ən yaxşı rəssam və musiqiçilərindən biridir. O, sovetlər dövründə SSRİ Rəssamlar İttifaqının üzvü olmuşdur. Hazırda Tiflisin qədim məhəllələrindən olan Xarpuxda Rzabala Rzayevin yurdunda yaşayıb-yaradır.

Cəlil Məmmədquluzadənin həyat yoldaşı Həmidə xanım Cavanşir öz xatirələrində yazır:

«Mirzə Cəlil Şərq musiqisini və aşıqları çox sevərdi. Gülablı aşıqları Nəcəfqulu və Abbasqulu ilə dostluq edərdi. Həmin aşıqlar qızımın ərə getməsi xəbərini eşitmiş, dəvət olunmadan özləri Tiflisə – bizə gəlmişdilər. Lakin mən və Mirzə Cəlil evlənmək münasibəti ilə keçirilən hər cür təntənənin ziddinə idik, ona görə heç nə təşkil etmək fikrində deyildik. O günlər müsəlmanlar mərhum Mirzə Fətəli Axundovun yubileyini keçirməyə hazırlaşırdılar. Bu işdə Mirzə Cəlil fəal iştirak edirdi. Yubiley müsamirəsi Dvortsov (Saray – M.M.) küçəsində Banovski teatrında keçirildi. Mirzə Cəlilin təklifi ilə aşıqlar müsamirədə oxuyub böyük müvəffəqiyyət qazandılar və bolluca pul aldılar. Aşıqlar yalnız bir axşam evdə bizim ailəmiz üçün oxudular və ertəsi gün çıxıb getdilər».

Həmin dövrlər Cabbar Qaryağdıoğlunu da Tiflisdə yaxşı tanıyırdılar.

Qaryağdıoğlu öz dəstəsi ilə İrandan qayıdarkən İrəvan şəhərinə gəlir. O, burada üç həftə gecə-gündüz toy məclislərində olur. Oradan da Tiflisə dəvət olunur. Tiflisdə şəhərin şənlik və məclislərində uğurla çıxış edərək tamaşaçıların rəbğətini qazanır. Burada Cabbar Qaryağdıoğlu azərbaycanlıların, gürcülərin məclislərində sevinclə qarşılanır. Belə ki, o, həmin vaxtlar Tiflisdə üç ay qalmalı olur. Tiflisin füsunkar gözəlliyinə valeh olan xanəndə onun şəninə mahnı da qoşur. «Tiflisin yolları» mahnısı o zamanlar ən sevimli mahnılardan biri idi.

Məşhur xanəndələrdən biri olan Məşədi Məmməd Fərzəliyev 1913-cü ilin yazında Zubalov adına xalq evi (indiki Kote Marcanişvili adına Dövlət Teatrı) tərəfindən Tiflisə dəvət edilir. Bu xalq evində Malıbəyi Həmid, Çəkməçi Məhəmməd, Məşədi Cəmil Əmirov, Seyid Şuşinski, Məcid Behbudov, Bala Məlik kimi məşhur sənətkarlar teatr tamaşalarında və ya «Şərq konsertləri»ndə çıxış edərdilər. O dövrün teatr afişalarında və konsert proqramlarında bu sənətkarların, həmçinin Məşədi Məmmədin də adına tez-tez rast gəlmək olardı. Tiflisdə verilən bir teatr tamaşası proqramında yazılmışdır: «1913-cü il may ayının 10-da Tiflisin K.Y.Zubalov adına xalq evində Sidqi Ruhullanın rejissorluğu ilə müsəlman opera həvəskarları üçün məşhur xanəndə Məşədi Məmməd Fərzəliyevin iştirakı ilə Üzeyir Hacıbəyovun «Leyli və Məcnun» operasının son pərdəsi tamaşaya qoyulacaqdı. Əsərdə Zeyd rolunu Məşədi Məmməd Fərzəliyev oynayacaqdı».

O dövrün məşhur xanəndələrindən biri də əslən Cənubi Azərbaycandan olan Əbülhəsən xandır.

1914-cü ilin mart ayında Əbülhəsən xan Avropaya qastrol səfərinə çıxarkən əvvəlcə Tiflisə gəlir. Onun ilk konserti həmin ay «Kazyonnı teatr»da (indiki Z.Paliaşvili adına Dövlət Opera və Balet Teatrında) olmuşdur.

O zaman Tiflisdə yaşayan məşhur müğənni Seyid Şuşinski Əbülhəsən xanın konsertlərində yaxından iştirak etmiş, qonaqlar üçün hər cür şərait yaratmışdı.

Azərbaycan Respublikasının xalq artisti, əslən tiflisli olan Mustafa Mərdanov xatirələrinin birində yazır:

«Şərqin məşhur xanəndələrindən sayılan Əbülhəsən xan öz dəstəsilə Tiflisə konsert verməyə gələndə, birinci növbədə Seyid Şuşinskinin görüşünə getdi. İki sənətkar çox səmimi görüşdülər. Seyid Şuşinski Cənubi Azərbaycandan gəlmiş qonaqlara öz xərci ilə frak tikdirib səhnəyə çıxartdı. Əbülhəsən xan ürəkaçan gözəl bir səslə «Bayatı-Şiraz» və «Rast» dəstgahı oxudu. O, dinləyiciləri valeh etdi. Bu konsertdə iştirak edən Gürcüstan opera sənətinin banisi Vano Saracişvili Əbülhəsən xanın sənətkarlığını yüksək qiymətləndirərək dedi: «Əbülhəsən xanın nəyi Karuzodan əskikdir». O, sonra səhnəyə çıxıb Əbülhəsən xanı bağrına basıb öpdü.

Əbülhəsən xanın konsertlərinin təşkilinə Seyid Şuşinski ilə birlikdə biz də kömək edirdik. İstəyirdik ki, qastrol səfərindən onlar öz vətənlərinə xoş təəssüratla getsinlər».

Əslən şuşalı olan Dabbağ Məhəmmədqulu və Zabul Qasım Əbdülbaqi ilə, Cabbar Qaryağdıoğlu ilə birlikdə bir neçə tədbirdə iştirak etmiş, məclislər yola salmışlar.

O vaxtlar tiflislilərin sevimli xanəndələrindən biri də Xan Şuşinski olmuşdur.

1922-ci ildə şuşalı tarzən Bala Məlikovun təşəbbüsü ilə Tiflisdə Şərq ansamblı təşkil olunur. 1926-cı ilədək fəaliyyət göstərən ansamblda müxtəlif vaxtlarda xanəndə Məşədi Məmməd Fərzəliyev, Məcid Behbudov, Musa Şuşinski, Aşıq Mirzə və başqaları çıxış etmişlər.

Məşhur xanəndə Seyid Şuşinskinin həyatında da Tiflis mühüm rol oynamışdır. Gənclik illərini Tiflisdə (1911-1919-cu illər) keçirən Seyid Şuşinski elə burada Şərqin məşhur tenoru Əbülhəsən xanın məktəbi ilə tanış olmuşdur. Onun bir xanəndə kimi formalaşmasında Azərbaycan vokal məktəbinin banisi Cabbar Qaryağdıoğlunun böyük təsiri olmuşdur.

Ömrünün müəyyən hissəsini Tiflisdə keçirən bu sənətkarlar Azərbaycan musiqisinin inkişafında və təbliğində mühüm xidmətlər göstərmişlər. Qədirbilən xalqımız bu sənətkarları həmişə hörmətlə yad edir, sevə-sevə xatırlayır.

***Klassiklərimizin yaradıcılığından***

## TİKMƏDAŞLI XƏSTƏ QASIM

### OLA

*Bir gözəl sevəsən boyu tamaşa,*
*Görən kimi könül ona bənd ola.*
*Gözəlliyi, gül camalı bir yana,*
*Dil-dodağı şəkər ola, qənd ola.*

*Bir gözəl sevəsən qaməti bəstə,*
*Görəndə aşiqi eyləyə xəstə.*
*Çoxdan axtarıram bir elə kəs də,*
*İşarə anlaya, dərdimənd ola.*

*Mən Qasımam, əl götürrəm canandan,*
*Canan qarşı gəlsə, keçərəm candan.*
*Rəngi artıq ola güldən, reyhandan,*
*Zülfləri boynuma bir kəmənd ola.*

### AŞNALIĞI

*Ay ağalar, gəlin sizə söyləyim,*
*Əzəl yaxşı olar, yar aşnalığı.*
*Sən sevəsən, yarın səni sevməyə,*
*Olar bülbül ilə xar aşnalığı.*

*Bağban odur zəhmət çəkə, əlləşə,*
*Saldığı bağ çiçəkləşə, gülləşə.*
*Əgər gücsüz güclü ilə güləşə,*
*Olar tərlan ilə sar aşnalığı.*

*Xəstə Qasım qəm əlindən məst ola,*
*Əhli-dərviş xırxasında pust ola.*
*Bir adam ki, loxma ilə dost ola,*
*Olar yağış ilə qar aşnalığı.*

**SAZ OLA**

*Usta, məni gözlərinə fəda qıl,*
*Səndən saz istərəm, amma saz ola!*
*Dindirəndə imran dillə danışa,*
*Şeyda bülbüllərtək xoşavaz ola!*

*Yamanı yamana, yaxşını mərdə,*
*Tərifini edim hər düşən yerdə.*
*Dolaşmaya simlər, vurmaya pərdə,*
*Gözəllərtək onda işvə, naz ola!*

*Xəstə Qasım sözüm söylərəm əyan,*
*Elə car eylərəm, bəyanbəbəyan.*
*Qiymətin soruşsan, tamam on tümən,*
*Nə ondan çox ola, nə də az ola!*

**EYLƏR-EYLƏR**

*Elə bir kişinin tut ətəyindən,*
*Bil, sənə imdadı ol eylər-eylər.*
*Zərrəcə üstündə olsa nəzəri,*
*Yerdən daş götürsən, ləl eylər-eylər.*

*Böhtan demə, böhtan tutar adamı,*
*Qul eylər, bazarda satar adamı.*
*Cəhənnəm odundan betər adamı,*
*Yoxsulluq yandırar, kül eylər-eylər.*

*Aqil insan deməz hər gördüyünü,*
*Daldalar düşməndən vay dərdiyini.*

*Görməzsən nakəsin pay verdiyini,*
*Versə də, töhmətin bol eylər-eylər.*

*Xəstə Qasım deyər sözün bu başdan,*
*Pay umma qohumdan, yaddan, qardaşdan.*
*Özün əmək çəksən, su çıxar daşdan,*
*Əridər dağları yol eylər-eylər.*

## YAXŞIDI

*Dəli könül, məndən sənə əmanət,*
*Demə bu dünyada qalım yaxşıdı.*
*Bir gün olar qohum, qardaş yad olar,*
*Demə, ulusum var, elim yaxşıdı.*

*Bir məclisə varsan özünü öymə,*
*Şeytana bac verib, kimsəyə söymə.*
*Qüvvətli olsan da yoxsulu döymə,*
*Demə ki, zorluyam, qolum yaxşıdı.*

*Qoçaqdan olubsan, qoçaq olgunan,*
*Qadadan, bəladan qaçaq olgunan.*
*Aşıq ol, comərd ol, alçaq*[1] *olgunan,*
*Demə, varım çoxdur, pulum yaxşıdı.*

*Xəstə Qasım, kimə qılsın dadını,*
*Canı çıxsın, özü çəksin odunu.*
*Yaxşı igid yaman etməz adını,*
*Çünki yaman addan ölüm yaxşıdı.*

[1] Açıq ürəkli

## OLMAZ

*Dəli könül, nə divanə gəzirsən?*
*Bivəfa dilbərdən sənə yar olmaz.*
*Düz çıxmaz ilqarı, əhdi-peymanı,*
*Hərcayıda namus, qeyrət, ar olmaz.*

*Üz vermə nadana, sirr vermə pisə,*
*Axır qəlbin ya inciyə, ya küsə.*
*Ot bitər kök üstə, əsli nə isə,*
*Yovşan bəsləməklə çəmənzar olmaz.*

*Vəfalıya əmək çəksən itirməz,*
*Bədəsil nəsihət, öyüd götürməz.*
*Qabaq tağı tər şamama bitirməz,*
*Göy söyüddə heyva olmaz, nar olmaz.*

*Təklif olunmamış bir yerə varma,*
*Nər olmaz meydanda hər bığı burma.*
*Seyraqub adama sən yaxın durma,*
*Xayin çıxar, onda düz ilqar olmaz.*

*Xəstə Qasım günü keçmiş qocadı,*
*Gələn bəzirgandı, gedən xocadı.*
*Sərv ağacı hər ağacdan ucadı,*
*Əsli qıtdı, budağında bar olmaz.*

## NECOLA

*Ay ağalar, nakam getdim dünyadan,*
*Yarəb, mənim xanimanım necola?*
*Gövhərtək sözlərim, bayatılarım,*
*Ləbi-şirin süxəndanım necola?*

*Anam yoxdur, qəbrim üstə yaş tökə,*
*Halalım yox, sinəm üstə saç tökə.*

*Qardaşım yox, qəbrim üstə daş tökə,*
*Yarəb, mənim ağlayanım necola?*

*Heyif ola, ağ biləklər, bazılar*[2]*,*
*Ahu otlar ceyran ilən yazılar*[3]*.*
*Qohumum yox, qardaşım yox, qazılar,*
*Yarəb, mənim hal-əhvalım necola?*

*Bu gen dünya üstümüzə dar ola,*
*Biz köçərik, yurdumuzda kim qala?*
*Əhmədimin rəngi-ruhu sarala,*
*Mənim sərvi-xuramanım necola?*

*Mən Qasımam, daha qalmadı tabım,*
*Qızılgüldən çəkilibdir gülabım.*
*Cədvəl-kəş*[4] *quranım, qırx cüt kitabım,*
*Üstü zərli qələmdanım necola?*



[2] Qolun biləkdən dirsəyə qədər olan hissəsi.
[3] Yaylaqda gün keçirməyə işarədir.
[4] Xanələrə bölünməyə, hər xanənin bəzəkli haşiyələrə alınmağına işarədir.



*Təranə CƏBİYEVA*

# ERMƏNİ XİSLƏTİ

***Torpağımıza qənim kəsilənlər folklorumuza da sahib çıxmaq istəyirlər.***

Çoxəsrlik mədəniyyət tariximizdə şifahi xalq ədəbiyyatının ən zəngin qolunu aşıq yaradıcılığı təşkil edir. El ağsaqqallarımız ötən əsrlərdən bugünümüzə bayatılar, təcnislər, qıfılbəndlər, qoşmalar, gəraylılar, dodaqdəyməzlər yadigar qoyub. Aşıq yaradıcılığını tədqiq etmək folklorşünas alimlərimizi həmişə düşündürmüşdür. Vaxtilə V.Xuluflu, H.Əlizadə, S.Mümtaz, H.Araslı, F.Qasımzadə, M.N.Təhmasib, Ə,Axundov, M.Seyidov, Ə.Qarabağlı, İ.Abbasov kimi tədqiqatçı alimlərimizin elmi araşdırmaları nəticəsində Azərbaycan folklor nümunələri damla-damla toplanaraq oxucuların diqqətinə çatdırılmışdır.

Bu gün torpaqlarının 20 faizi işğal altında olmaqla bərabər bir milyonluq qaçqını olan vətənimizin mədəniyyət abidələri, eləcə də zəngin folklor nümunələri də ermənilər tərəfindən zəbt olunub. Azərbaycanlılara məxsus bayatıları, qoşmaları, el nəğmələrini oğurlayaraq öz adlarına çıxmaları isə düşünülmüş erməni cinayətidir. Ermənilər torpaqlarımıza qarşı iddialı olduqları kimi, ulularımızdan bizə miras qalan folklorumuza da qənim kəsiliblər. Planlı şəkildə erməni xəyanəti babalarımızın əmanəti olan şifahi xalq nümunələrimizdən yan keçməyib. Araşdırmalar nəticəsində aydın olur ki, ermənilərin mədəniyyətimizə doğru zorakılıq, vəhşilik hissi hələ ötən yüzilliklərdən başlayıb. Keçmiş sovet dövründə tanınmış tədqiqatçı alim Mirəli Seyidovun böyük uzaqgörənliyi, vətənpərvərliyi sayəsində erməni əlifbası ilə yazılan Azərbaycan bayatılarının üzə çıxarılaraq xalqımıza məxsusluğu sübut olunmuşdur. Həm də bu milli

nümunələr alimin köməyi ilə toplu halında işıq üzü görmüşdür. Mirəli Seyidovun tutarlı elmi sübutunun faktlarla əsaslandırılması xain ermənilərin bayatılarımıza, xalq mahnılarımıza sahiblik iddiasını da puça çıxarmışdır.

XVII-XVIII əsrlərdən başlayaraq erməni aşıqları, xüsusən Sayat Nova Azərbaycan aşıq sənətində tanınan ustad sənətkarlarımızdan, eləcə də M.P.Vaqifin qoşmalarından istifadə edərək bəhrələnmişlər.

Azərbaycan aşıq sənətində qəhrəmanlıq və məhəbbət dastanları mühüm yer tutur. Bu dastanların yaranma tarixi də qədimdir. "Kitabi-Dədə Qorqud" dastanı türk xalqlarının tərcümeyi-halı olmaqla bərabər, həm də Azərbaycanın tarixi əraziləri haqqında dolğun məlumat verir. Koroğlu xalqımızın igid oğlu olaraq, sadə insanları zülmdən, ədalətsizlikdən qoruyan qəhrəmandır. Bu dastan da xalqın sevgisindən yaranmışdır. "Şah İsmayıl" Səfəvi hökmdarı, sərkərdə Ş.İ.Xətainin həyatından, "Aşıq Qərib" təbrizli Aşıq Qəribin məhəbbət və qəhrəmanlığından qaynaqlanaraq aşıqlarımızın dilinin əzbəri olub. Digər dastan "Əsli və Kərəm"dir ki, əsər Gəncə xanı Ziyad xanın oğlu Kərəmdən və xanın xəzinədarı Qara Keşişin qızı Əslidən bəhs edir. Diqqət etsək görərik ki, bu dastanlar ötən əsrlərdən bəri xalqın yaddaşında yaşayır. Ozan aşıqlarını da yetirən bizim torpaqdır. Xalqla birgə təmasda olan aşıqlarımız illərlə telli sazı sinələrinə basaraq getdikcə ustadlaşıblar. Şifahi xalq ədəbiyyatından qaynaqlanan dastanlarımız sonradan qonşu xalqların da yaradıcılığına təsir edə bilmişdir.

Tarixi faktdır ki, çar Rusiyası dövründə indi Ermənistan adlanan Azərbaycan torpaqlarında, Qarabağda erməni əhalisinin sayı sürətlə artırıldı. Məhz bu zamandan etibarən şifahi xalq ədəbiyyatımızın işğalına doğru da addım atıldı. Hətta folklorumuza qarşı açıqdan-açığa hücum faktları ötən əsrdə erməni mənbələrində də qeyd olunub. Tədqiqatçı-alim Mirəli Seyidov tarixi mənbələrə əsasən qeyd etmişdir: "Hələ XIII əsrdən başlayaraq erməni şairləri Azərbaycan aşıqlarının şeir formalarından, xalq müğənnilərinin havalarından (motivlərindən) istifadə etmişlər". Alimin sonrakı tədqiqatlarına istinadən demək olar ki, əsrlər boyu ermənilərin bayatılarımızdan istifadə etməsi faktına rast gəlinir. Elyas Muşeqyanın 1721-ci ildə nəşr olunmuş "Nəğmələr" kitabında bu məsələlər öz əksini tapıb. 1868-ci ildə erməni S.Palasyan yazırdı: "Bizim mahnıların havası müxtəlifdir. Tacikistanda tacikin, Gürcüstanda gürcünün, Yerevan, Şuşa, Ağkilsədə türkün, İranda farsın, ümumiyyətlə, hansı xalqın təsiri altında olmuşuqsa, həmin xalqın da mahnılarının havalarını götürmüşük". Digər erməni müəllifi M.Nalbandyan isə ötən yüzillikdə belə qeyd etmişdir: "Ancaq havaların əksəriyyəti türklərdən (yəni azərbaycanlılar-

dan) götürülübdür. Mən ermənilərin yaşadıqları çox yerləri dolaşmışam. Həmişə də çalışmışam ki, sırf ermənicə deyilmiş bir şey eşidəm. Lakin həmin şeyi dinləmək indiyə kimi mənə nəsib olmamışdır". Ermənilərin yüzillər öncə dediklərindən belə qənaətə gəlmək olar ki, xain düşmənlərimiz əsrlər boyu dədə-baba torpaqlarımızla yanaşı, milli-mənəvi dəyərlərimizə, folklorumuza, aşıq ədəbiyyatına sahib çıxmaq arzularına böyük ustalıqla nail ola biliblər. Ermənistan arxivlərində qədim əlyazmalarımız yatır. Bunlar Azərbaycan mədəniyyətinin tarixindən xəbər verir. Təəssüf ki, indi onların taleyindən xəbərimiz yoxdur.

Bu gün də xalq mahnılarımıza, rəqslərimizə, musiqi incilərimizə, bir sözlə, mədəni irsimizə ermənilər tərəfindən hücum davam etməkdədir. Xain qonşularımız nə qədər saxtakarlıqlar etsələr də, bir həqiqəti gizlətmək mümkün deyil: bizim zəngin mədəniyyətimiz, eləcə də aşıq sənəti dünənimizdən bu günümüzə bir körpüdür. Bu körpünü yaradan ustad aşıqlarımız həmişə el sənətində ucalaraq heç vaxt yalanı, böhtanı, haramı qəbul etməyiblər. Qərinələr, yüzilliklər ötəcək, aşıq sənəti Azərbaycan xalqının qanına hoparaq daima xalqımızla birgə yaşayacaq. Bu yolun gələcək davamçıları yenə də ustadları kimi, Tanrı tərəfindən seçilən haqq aşıqları – azərbaycanlılar olacaq.



## *CƏNUBDAN SƏSLƏR*

**Səlcuq ŞAHBAZİ**



### ALLAH, ALLAH

*Yaman darıxıram, qəlbim darıxır,*
*Alışır sinəmdə köz, Allah, Allah.*
*Bilmirəm ki, gəlim, ya da gəlməyim,*
*Qaradı yanında üz, Allah, Allah.*

*Əsib titrəmişəm qarlı qışında,*
*Bahar yağışında, yaz yağışında.*
*Nə səhv eyləmişəm dolanışımda,*
*Çeviribsən məndən üz, Allah, Allah.*

*Hər bir qəmdən çatıb doyunca payım,*
*Göylərə ucalıb harayım, hayım.*
*Bilmirəm ki, yazım, ya da yazmayım,*
*Yaman tərsə gəlir söz, Allah, Allah.*

*Nasazdı həmdəmim, göydən aslanıb,*
*Şeirim, sözüm qəlbim kimi yaslanıb.*
*Nə zamandı bağlı qalıb paslanıb,*
*Durnaboğaz tavar saz, Allah, Allah.*

*Yazıq Şəhbazidən tutmursan soraq,*
*Olma nəzərindən salıbsan qıraq.*
*Qaranlığa düşüb qalan yol-yolaq,*
*İtirir yolları göz, Allah, Allah .*

## SÖZƏ HƏSRƏTƏM

*Aç şəkər dilləri, bal dodaqları,*
*Həsrətəm, bir şirin sözə həsrətəm.*
*Örtüyün altında dustaqda qalan,*
*Yanağa həsrətəm, üzə həsrətəm.*

*Eşq atəşin qalanıbdı canıma,*
*Od vurub cismimə, xanimanıma.*
*Utanıram, necə deyim xanıma,*
*O qələm qaşlara, gözə həsrətəm.*

*Şəhbazi həsrətdi bircə görüşə,*
*Lalə yanaqlara, dəhana, dişə.*
*O əzəl sallanıb keçən yerişə,*
*Baxışa, gülüşə, naza həsrətəm.*

## DASTAN OĞLUYAM

*Aşıqlığın keşiyində durmuşam,*
*Alışıb oduna yanan oğluyam.*
*Qoruğuma təpiləni talaram,*
*Halaypozan, Tüpdağıdan oğluyam.*

*Mən aşığam, saz atamdı, söz anam,*
*Saz sinəmdə, söz dilimdə nişanam.*
*Təpədən-dırnağa Azərbaycanam,*
*Fəxr edirəm, Azərbaycan oğluyam.*

*Dədə Qorqud şöhrətimdi, şanımdı,*
*Duaları təskinim, dərmanımdı.*
*Qoruyaram, dastanları canımdı,*
*Danışıq oğluyam, dastan oğluyam.*

*Sinə gərrəm laf eyliyən sözünə,*
*Ölümdüsə, dik baxaram gözünə.*
*Ayaq qoydum babaların izinə,*
*Bu karvanda bir bəzirgan oğluyam.*

*Şəhbaziyəm, qopuzların himiyəm,*
*Mizrabıyam, pərdəsiyəm, simiyəm.*
*Mən Ağ Aşıq, Allahverdi kimiyəm,*
*Şah yuxu havasın çalan oğluyam.*

**YARAŞMIR**

*Deyim, necə deyim, deməsəm olmur,*
*Çox aşıq var, həqqən, saza yaraşmır.*
*Müqəddəsdi, pirdi aşıq sənəti,*
*Fırıldağa, oyunbaza yaraşmır.*

*Üzdən aşıq gördüm, astarı kindən,*
*Araz tərsə axır Kür yerişindən.*
*Utanmır yüzdə bir, mində birindən,*
*Sifəti sifətə, üzə yaraşmır.*

*Şəhbazi, aşıq var, ilhamı nurdan,*
*Kəlməsi qurtarır bir eli dardan.*
*Bəzi də qığıdır söz ordan-burdan,*
*Yenə də sözləri sözə yaraşmır.*

**PARA, DÜNYA**

*Kimsə səndən aparmayıb,*
*Qızıl, gümüş, para, dünya.*
*Bir de görüm, qalan varmı,*
*Salmıyasan tora, dünya.*

*Dünya kimin çürüdəcək,*
*Kimin ağa bürüdəcək,*
*Bərk tutanı sürüdəcək,*
*Cəhənnəmə, gora, dünya.*

*Kimə verib tacı, taxtı,*
*Şəhbaziyə yatmış baxtı.*
*Nə oyundan çıxacaqdı,*
*Daha bundan sonra dünya?!*

*SAZIMIZ – SAZBƏNDİMİZ*

# MÜƏLLİM, SAZ İFAÇISI, SAZBƏND



İxtiyar Mircəfər oğlu Seyidov 1966-cı il dekabrın 18-də Naxçıvan Muxtar Respublikasının Şahbuz rayonunun Kükü kəndində anadan olub. Hələ uşaqlıqdan sazın ecazkar səsi onu valeh edib. Orta məktəbdə oxuyarkən bir gün Kükü kənd mədəniyyət evinin yanından keçəndə yenə saz səsi eşdib və ora yaxınlaşaraq xəlvəti qulaq asmaq istəyib. O günləri İxtiyar Seyidov belə xatırlayır:

"Elə bir az qulaq asmışdım ki, birdən içəridən bir səs gəldi:

– "Ay bala, o kimdir, gəl içəri".

Mən içəri keçdim və gördüm ki, Aşıq Fərrux saz çalır.

Əli ilə mənə işarə etdi ki, yaxına gəl.

Mən çəkinə-çəkinə ona tərəf yaxınlaşdım və o məndən soruşdu ki, nə üçün gəlmisən. Mən də dedim ki, saza qulaq asmaq üçün gəlmişəm.

Aşıq Fərrux bir az saz çaldı, sonra sazı mənə tərəf tutaraq "Al çal görüm", – dedi.

Dizlərim titrədi, bir anlığa dünya başıma fırlandı.

– Qorxma, al çal, – deyə Aşıq Fərux yenə dilləndi.

Əllərim titrəyə-titrəyə sazı aldım. Qəribə hisslər keçirirdim, bilirdim ki, əlimdəki saz ən müqəddəs bir şeydir.

Ancaq nə qədər çalışsam da, onu çala bilmədim.

Beləliklə, sazın dərdi məni xəstə etdi. Gecə-gündüz bu dərd məni qoymadı rahat olam. Həyətimizdə qurumuş bir qoz ağacı var idi, bir gün onu xəlvəti kəsərək səhərə qədər ondan bir balaca saz düzəltdim və telefon xəttindən 3 tel kəsərək bu saza bağladım. Havalar çox soyuq olduğundan artıq hiss edirdim ki, özüm üçün gizli bir yer tapıb işimi sona çatdırmalıyam. Belə qərara gəldim ki, anam çörək yapıb qurtarıb, təndir indi isti olar, gedim orada isinim və işimi qurtarım. Belə də etdim. Soyuq dekabr ayı idi. Gecəni səhərə qədər orada qaldım və sazı çalmağa başladım. İlk dəfə "Apardı sellər Saranı" xalq mahnısını həmin günü öyrəndim".



Aşıqlığa və sazbəndliyə gəlişinin səbəbini belə izah edən İxtiyar elə o vaxtdan bu sənətlə məşğul olmağa başlayıb. Bu sahədə bildiklərini və təcrübəsini möhkəmləndirmək üçün ustad aşıqlardan məsləhət alıb. Onun məsləhət aldığı aşıqlardan biri də Şahbuz rayonunun Aşağı Qışlaq kəndində yaşayan Sərraf Qasım olub. O, İxtiyara usta Xudunun haqqında çox maraqlı söhbətlər edib və sazı necə düzəltməyin sirlərini öyrədib.

Sonradan sazın tarixi də onu maraqlandırdığından qədim musiqi alətlərindən qopuz, çoğur, tənbur, bərbət, rübab, ud, çəğanə, ney, çəng və digərlərinin bərpası ilə məşğul olmağa başlayıb.

Ötən əsrin 80-ci illərindən sazın təmiri və istehsalı ilə məşğul olmaqla yanaşı, konsertlərdə və dövlət tədbirlərində də çıxış etməyə başlayıb. 1990-1998-ci illərdə Naxçıvan Muxtar Respublikası Estetik Tərbiyə Mər-

kəzində saz dərnəyi yaradaraq bir filialını da Şahbuz rayonunun Kükü kəndində açıb. 30-dan artıq şagirdə sazın sirlərini təmannasız öyrətməkdən böyük mənəvi zövq alıb.

İ.Seyidov 1998-ci ildə Naxçıvan Dövlət Universitetinə daxil olub. 2000-ci ildən indiyə qədər Naxçıvan Musiqi Kollecində saz ixtisası üzrə pedaqoji fəaliyyətlə məşğul olur.

1998-ci ildə onun düzəltdiyi bir neçə musiqi aləti Naxçıvanda 4 dəfə baxışdan keçərək Bakı şəhərinə göndərilib və burada da 3 dəfə baxışdan keçirilərək mədəniyyət nazirliyinin Fəxri Fərmanına və mükafata layiq görülüb.

1999-cu ildə Türkiyənin Bayburt şəhərində keçirilən "Dədə Qorqud-1300" festivalında, 2003-cü ildə Bakı şəhərində keçirilən "Beynəlxalq Asiya bayramı"nda iştirak edib.

Azərbaycan aşıqlarının V qurultayının nümayəndəsi olub, 2010-cu ildə respublikamızda keçirilən I Beynəlxalq Aşıq Festivalının iştirakçısı kimi Diploma layiq görülüb.

O, ictimai və pedaqoji fəaliyyətlə yanaşı, bu gün də sazbənd kimi fəaliyyət göstərir. Məhz onun sayəsində muxtar respublikada saza olan tələbat qismən də olsa təmin olunur. Onun düzəltdiyi sazlardan xarici ölkələrə aparılanı da az deyil.

İ.Seyidov eyni zamanda 2009-cu ilin dekabr ayından Naxçıvan Aşıqlar Birliyinin sədridir.

**M.NƏBİOĞLU**



MÜNDƏRİCAT

